"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



H.Əliyev

"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir"

ADPU 100

## ADPU və Corc Vaşinqton Universiteti arasında ikili diplom proqramı

ADPU və Corc Vaşinqton Universiteti arasında ikili diplom proqramı imzalanıb Yanvarın 31-də Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) və ABŞ-ın Corc Vaşinqton Universiteti arasında ikili diplom proqramı üzrə sazişin imzalanma mərasimi keçirilib.Mərasimdə Təhsil naziri Ceyhun Bayramov, Corc Vaşinqton Universitetinin Təhsil və insan inkişafı fakültəsinin dekanı Maykl Foyer, ADPU-nun rektoru professor Cəfər Cəfərov, ABŞ-ın ölkəmizdəki səfiri Örl Litzenberqer və digər rəsmi qonaqlar iştirak ediblər.Bildirilib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin müvafiq Sərəncamı ilə imzalanmış "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı" çərçivəsində həyata keçiriləcək ikili diplom proqramı təhsilin idarəolunması üzrə mütəxəssislərin hazırlanmasını nəzərdə ABŞ tərəfi ilə aparılan danışıqlara əsasən, proqram çərçivəsində 2020-2021-ci tədris ilindən etibarən ADPU-da magistratura pilləsinə qəbul aparılacaq. Magistratura pilləsində təhsilin 2 il müddətinə ingilis dilində aparılması nəzərdə tutulur. Abituriyentlər qəbul üçün ilk olaraq Dövlət İmtahan Mərkəzi (DİM), daha sonra Corc Vaşinqton Universiteti tərəfindən təşkil edilən imtahanlarda iştirak etməlidirlər. Tədris Corc Vaşinqton Universitetindən dəvət olunan və eyni zamanda yerli müəllimlər tərəfindən aparılacaq. Sonda məzunlara həm Azərbaycan Dövlət Pedaqoji Universiteti, həm də Corc Vaşinqton Universitetinin diplomları veriləcək.




səh.2



ADPU SON 5 İLDƏ









səh.3

Bu gün təhsildə nə dəyişməlidir?
Prof. C. Cəfərov və dos. İ. İsgəndərov yazır...



Prof. M. Hüseynova:
"Əsrə bərabər günlərə şahid olduq!"

səh.7




Zəfəri inşa edən MÜƏLLİMLƏRİMİZ - ADPU-nun Şəhidləri

səh.6

səh.8



ADPU-nun məşhur məzunları

Qəzet 1958-ci fevralın 1-dən nəşr olunur. 63 Yanvar 2021 / № 01 (1104)

## ADPU son 5 ildə

Bu il 100 illiyini böyük qürurla qeyd edən Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) son 5 il ərzində, yəni 2016-2020-ci illərdə böyük inkişaf yolu keçmişdir. Azərbaycan Respublikasının prezidenti cənab İlham Əliyevin daim diqqət və qayğısı altında olan ADPU son illər geniş və hərtərəfli islahatların keçirilməsi ilə diqqəti cəlb edir. Professor Cəfər Cəfərovun ADPU-ya rektor təyin olunması bu islahatların başlanğıcıdır. Cəfər Cəfərov rektor təyin olunduqdan sonra ADPU-da həm maddi-texniki baza, həm tədris, həm sosial həyat, həm də elmi fəaliyyət uğurla inkişaf edir. Bu məqalədə bu islahatların kiçik bir hissəsini qeyd etmək olar. Son 5 il ərzində ADPU-da gəncləşdirmə siyasətinə geniş yer ayrıldı, bundan əlavə universitetin məzunları universitetin gələcək fəaliyyətinə cəlb olundu. Bu proses ADPU-nun dinamik inkişafına təkan verdi. ADPU-da imtahan sisteminin test üsulundan yazılı üsula keçməsi isə sözün əsl mənasında təhsilin keyfiyyətinə can verdi. Bu minvalla ölkədə müəllim hazırlığı kursuna yeni sistem gətirildi və bu sistem qısa zamanda özünü doğrultdu. Statistik göstəricilərə baxdıqda bunu aydın görmək olar. Məsələn, 2019-ci ildə ADPU məzunlarının Müəllimlərin işə qəbulu (MİQ) imtahanlarında nəticələri 2016-cı ildəki nəticələrdən təxminən 400% daha yaxşı olmuşdur. Son dövrdə ADPU-da şəffaf imtahan sisteminin yaradılması, tələbə-rəhbərlik münasibətlərinin yaxşılaşdırılması ADPU-nun inkişaf prosesinə əvəzsiz töhfə verən amillərdəndir.ADPU-da adlı təqaüdlərin təsis edilməsi,həmçinintələbələrin digər stimulverici işlərə cəlb olunması, rektor və prorektorların daimi olaraq tələbələrlə görüşlər keçirməsi tələbələrin tədrisə olan marağını daha da artırmışdır. Universitetdə tələbələrin maraq dairəsinə uyğun fəaliyyətlərin genişləndirilməsi, onların sosial problemlərinin həll olunması və daim tələbələrə hər mövzuda dəstək verilməsi ADPU-nu tələbələrin sevimli universitetinə çevirmişdir.Bütün bunlardan əlavə, bu dövrdə ADPU-da şəffaf seçki sisteminin yaradılması və təkmilləşdirilməsi işi başa çatdırılmışdır. Artıq sadəcə fakültə dekanı, kafedra müdiri yox universitetdə müəllim və tyutorlar da şəffaf seçki yolu vəzifəyə seçilirlər. Universitetdə tyutor hazırlığı kursları yaradılmışdır. Bütün bu islahatlar sadəcə Bakıda yox, universitetin bütün filiallarında və nəzdində olan kollecdə də mütəmadi davam edir. Universitetin beynəlxalq əməkdaşlığı daha da genişlənmiş, mübadilə proqramları ilə bir çox ölkələrə tələbə və müəllimlərini göndərməsi prosesi daha da gücləndirilmişdir. Fakültələrdə aparılan quruculuq və inkişaf prosesi də sürətlənmişdir. Qısa müddət ərzində Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova tərəfindən Filologiya fakültəsinin saytı və qəzeti təsis edilərək işıq üzü görmüşdür. Digər fakültələr də bu qəbildən olan işlərin görülməsinə başlamışlar. Universitetdə tələbə təşkilatlarına da geniş dəstək göstərilir. Bu illər ərzində təşkilatların fəaliyyəti genişlənmiş, üzvləri artmış, yay düşərgələri keçirilmişdir.Xüsusən son bir ildə dünyanı cənginə alan koronovirus pandemiyasının yaratdığı çətinliklər fonunda ölkəmizdə tədrisin məsafədən təşkili və distant biliyin qiymətləndirilməsi sahəsində də



ADPU ölkəmizdə qabaqcıl yerlərdən birini tutur. Ümumilikdə son 5 ili ADPU-nun inkişafında xüsusi dövr kimi qeyd etmək olar. Sadəcə bu qədər kiçik bir yazı da son dövrdə Azərbaycanın ən böyük müəllim yetişdirən ali təhsil müəssisəsinin nə qədər irəlilədiyinə dair ilkin təsüratlar
Təhsil Millətin Gələcəyidir, Hər Şey Təhsil naminə!
"Gənc Müəllim"

## ADPU-nun Elmi Şurasının onlayn iclası keçirilib

Dekabrın 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının növbəti onlayn iclası keçirilib. ADPU-nun rektoru, Elmi Şuranın sədri, professor Cəfər Cəfərov iclası giriş sözü ilə açaraq gündəlikdə olan məsələləri iştirakçıların nəzərinə çatdırıb. Rektor iclasın gündəliyinə "2020-2021-ci tədris ilinin payız semestrinin qış imtahan sessiyasına hazırlıq və qarşıda duran vəzifələr haqqında", "Azərbaycan Dövlət Pedaqoji Universitetində 2021-ci ildə keçirilməsi nəzərdə tutulan beynəlxalq və respublika səviyyəli elmi konfranslar haqqında" və cari məsələlərin daxil olduğunu bildirib. Rektor Cəfər Cəfərov çıxışında Elmi Şura üzvlərini Vətən müharibəsində əldə edilən şanlı Qələbə münasibətilə təbrik edib. 44 günlük Vətən müharibəsi ümummilli liderimiz Heydər Əliyevin layiqli davamçısı, Ali



Baş Komandan cənab İlham Əliyevin və Müzəffər Azərbaycan Ordusunun möhtəşəm zəfəri ilə başa çatıb. 44 günlük haqq savaşımız Azərbaycan tarixinə qızıl hərflərlə əbədi yazılıb. Bu qürurlu tarixi öz qanları ilə yazan, Vətənimizin azadlığı uğrunda canlarından keçən şəhidlərimizə Uca Tanrıdan rəhmət, ailələrinə səbr, yaralı əsgərlərimizə şəfa diləyib. lmi Şura Tədris işləri üzrə prorektor, Eldar Aslanov və Elm və İnnovasiyalar üzrə prorektor, professor Asəf Zamanovun hesabatını qəbul edib. Daha sonra Rektorun müşaviri Ümid Mehdiyev İnformasiya-Kommunikasiya Texnologiyaları Mərkəzinin Əsasnaməsinin təsdiqi barədə məlumat verib. Sonda rektor Cəfər Cəfərov qarşıya qoyulan vəzifələrin uğurla həyata keçirilməsi üçün öz tapşırıq və tövsiyələrini verib.

## ADPU-da ulu öndər Heydər Əliyevə həsr olunmuş "Missiya" kitabının təqdimatı keçirilib



2020-ci ilin yanvarın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Filologiya fakültəsinin dekanı, filologiya elmləri doktoru, professor Mahirə Hüseynovanın ümummilli lider Heydər Əliyevəhəsr etdiyi "Missiya" kitabının təqdimatı keçirilib. Kitabın elmi redaktoru və ön sözün müəllifi akademik İsa Həbibbəyli, elmi məsləhətçisi tarix elmləri doktoru, professor Cəfər Cəfərov, rəyçiləri filologiya elmləri doktorları Himalay Qasımov və Buludxan Xəlilovdur. Təqdimatda universitetin rəhbərliyi və professor-müəllim heyəti iştirak edib.

## Millət üçün ünvana döndün



Çıxdın zirvəsinə uca dağların
Göylərə çəkilib dumana döndün
Silib göz yaşını al yanaqların
Qəlblərdə ən əziz Mehmana döndün

Nahaq qan qalammaz yerdə, deyirdin
Biz dəva gəlmişik dərdə, deyirdin
Soruşsan ünvanın Bərdə deyirdin
Özün millət üçün ünvana döndün

Göydən Allah baxır, haqq divanı var
Soraq məqamı var, sorğu anı var
Hərənin qəlbində qəhrəmanı var
Minlərin gözündə mizana döndün

Özün manşırladın qismət oyununu
Yuva tək seçib də Vətən qoynunu
Anan el içində bükməz boynunu
Dərdindən əriyib dərmana döndün

Bilirdin bu Vətən nədən yaxşıdır
Qoynunda göyərən bitən yaxşıdır
Övladda havara yetən yaxşıdır
Havara yetişib aslana döndün

Nə qədər istəyə yerbəyer yaza
Ürəyi üçuna nə deyir yaza
Mahirə şəninə yüz şeir yazar
Bəs etməz, yazdığın dastana döndü

**ADPU-nun Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynovanın şəhid Xudayar Yusifzadəyə həsr etdiyi şeir.**

## Bu gün təhsildə nə dəyişməlidir?




Təhsil müəssisələrində ənənəvi (üz-üzə) təhsil formasının məhdudlaşdırılması dünya təhsil sisteminə ciddi təsir göstərdi. 2020-ci ilin aprel məlumatlarına əsasən təhsil müəssisələrinin bağlanılması Azərbaycanda 1.9 milyon (1.7 milyon orta məktəb, 200 min ali təhsil, doktorantura) olmaqla, dünyada 1.7 milyarddan çox təhsilalanı ənənəvi təhsildən kənarda saxladı. UNESCO-nun UNESCO-nun məlumatına görə, 191 ölkə bütün, 5 ölkə isə qismən təhsil müəssisələrində məhdudiyyət tətbiq etdi ki, bu da ümumi təhsilalanların 98.4%-ni əhatə edir. Eyni zamanda, müxtəlif təhsil səviyyələrində bəzi beynəlxalq proqramlar və layihələr dayandırıldı. Əksər ölkələr gözlənilmədən qarşıya çıxan bu problemə çevik reaksiya verdilər və təhsil mümkün olan bütün vasitələrdən istifadə edilməklə davam etdirildi. Fəxredici haldır ki, Azərbaycan təhsil sistemi problemə daha çevik reaksiya verən təhsil sistemləri arasında idi. Təhsil müəssisələrinin bağlanılmasının təkcə təhsilalanlara və təhsilverənlərə deyil, həmçinin iqtisadi və sosial münasibətlərə də uzun müddət davam edəcək təsir göstərəcəkdir. COVID-19 cəmiyyətdə bütün münasibətlərə (sosial-iqtisadi, lokal və qlobal), o cümlədən də təhsil münasibətlərinə ciddi təsir göstərdi və gündəmə yeni yanaşmaların vacibliyi, ənənəvi təhsil çatışmazlıqları, rəqəmsal öyrənmənin əhəmiyyəti və s. çağırışlar gətirdi. COVID-19 pandemiyasının təhsilə təsiri müxtəlif təhsil institutları, ekspertləri və mərkəzləri tərəfindən araşdırılır, hesabatlar yazılır və təhlil edilir. Bu araşdırmalardan biri də dünyaca məşhur tədris şirkəti olan "Pearson"-nun sifarişi ilə 2020-ci ilin iyun ayında "The Harris Poll" tərəfindən aparılan sorğudur. Bu sorğunun nəticələri əsasında hazırlanmış hesabatda göstərilir ki, COVID-19 təhsilin modernləşməsinin "katalizatorudur". Təbii ki, bu araşdırmalar hələ uzun müddət davam edəcək və müxtəlif tədqiqat və hesabatlar yazılacaq. Lakin bu gün ən azı demək olar ki, koronovirus pandemiyası nəticəsində təhsil sistemində uzunmüddətli strategiya və qaydaların yenidən işlənilməsinə ciddi ehtiyac var. Belə ki, bəzi təhsilalanların təhsil müddəti uzandı, təhsil müəssisələrinin işi məhdudlaşdırıldı, təhsilin təsir imkanları məhdudlaşdı və bunların ümumi nəticəsi təhsilə olan marağı dəyişdi. Araşdırmalar və təhlillər onu göstərir ki, təhsilə maraq ənənəvi formadan çıxdı, bəzi ekspertlər koronovirus pandemiyasının təhsilə marağın azalmasına səbəb olduğunu iddia edirsə, bəzi hesabatlarda isə mövcud vəziyyətin təhsildə imkanlar yaratdığı və ona inamın artdığı qeyd olunur. Bizim araşdırmamız onu göstərir ki, təhsilə maraq azalmayıb, sadəcə olaraq təhsilə marağın forması dəyişib. Təhsil sisteminin sənayenin tələblərinə uyğunlaşması, cəmiyyətin tələblərinə çevik cavab mexanizminin qurulmasının vacibliyi koronovirus pandemiyasından çox-çox əvvəllərdə əsas müzakirə mövzularından biri idi. Təhsil sistemində dəyişikliklər hər zaman mövcud olmuş və olacaqdır. Koronovirus pandemiyası sadəcə olaraq bunu sürətləndirdi və yuxarıda qeyd edildiyi kimi, ənənəvi təhsil çatışmazlıqları, rəqəmsal öyrənmənin əhəmiyyətini, çevik qərar vermə qabiliyyətinin vacibliyini üzə çıxartdı. Hələ keçən əsrin sonlarından 21-ci əsrin təhsil sistemi, təhsil paradiqması, çağırışları barədə çoxlu tədqiqatlar aparılmış, müxtəlif yanaşmalar və strategiyalar təklif olunmuşdur. Bütün bu tədqiqatlar və ekspert rəyləri 21-ci əsrdə də təhsilin vacibliyini, xüsusilə də orta təhsildən sonrakı təhsilin daha da vacib olacağını söyləmişlər. Orta təhsildən sonrakı təhsil imkanlarının artırılması və həyat (yaşayış) keyfiyyətinin yüksəldilməsi, iqtisadi mobilliyin təmin olunması, analitik düşünmə və düşüncələrinin effektiv idarə olunması, məqsədə çatmağa və həyatda müvəffəqiyyət qazanmağa vasitə kimi xarakterizə olunur. Bu gün təhsil sistemində nə, necə dəyişməlidir? Nə üçün dəyişməlidir? Texnoloji inkişafın təhsilə transformasiyası necə olmalıdır? Məsafədən (distant) təhsil necə təşkil olunmalıdır? Bu yazıda beynəlxalq ekspertlərin, dünyanın aparıcı təhsil institutlarının bu suallar ətrafında düşüncələrinin təhlili və müəlliflərin fikirləri öz əksini tapmışdır. Məsələn, davamlı inkişaf üzrə BMT-nin 2020-ci il hesabatında da COVID-19 pandemiyasından sonrakı dövrdə davamlı inkişaf məqsədlərində ola biləcək dəyişikliklər sırasında təhsil üzrə məqsəd (keyfiyyətli təhsil) ön sıradadır, bundan əlavə, həmin hesabatda davamlı inkişaf üçün rəqəmsal inqilabın nəticələrindən istifadənin də ön sıralara çıxacağı qeyd edilmişdir. Təhsil yanaşmasının və məzmununun dəyişməsini zəruri edən çoxlu amillər sadalamaq olar. İlkin olaraq aşağıdakıları nəzərə almaq lazımdır: * Bu günün təhsilalanları dəyişmişdir. Bu günün tələbələri dünənin təhsilalanlarından çox fərqlidir. Onlar oxumaqla bərabər işləmək niyyətindədirlər, çoxlu informasiya mənbələrinə malikdirlər, ailədə uşaq sayı az olduğundan ailənin ilk təhsil alanıdırlar, qeyri-bərabər təhsilin şahidi olurlar və s; * Tələbələrin və valideynlərin prioritetləri dəyişmişdir. Tələbələrin əksəriyyəti nəyi öyrənsəm daha tez işə qəbul edərlər kimi bir düşüncə ilə yaşayır. Tələbələr və valideynlər tez bir zamanda qoyduqları investisiyanı geri qaytarmaq istəyir. Bu gün çox az sayda tələbə öz dünyagörüşünü artırmaq, savadlı olmaq, həyat fəlsəfəsini anlamaq və s. barədə düşünür; * Cəmiyyətin təhsildən gözləntiləri dəyişmişdir. Təhsilin qiymətləndirilməsində məsul şəxslər, qanunvericilərin hazırladığı normativ-hüquqi aktlar, vəkillər və valideynlərin təhsildən tələbləri, tələbələrə göstərilən xidmətlərin sayını və keyfiyyətini artırmışlar. Tələbələr təhsil müəssisəsi seçimi zamanı təkcə təhsilin keyfiyyətini deyil, həmçinin onun xidmətlərinin spektrini, tələbələrin sosiallaşması imkanlarını da nəzərə alırlar; * Təhsil paradiqması qocalıb və çevik deyil, sürətlə dəyişən dünyaya çevik inteqrasiya oluna bilmir, universaldır və hər şəxsin şəxsi istəklərinə adaptasiya oluna bilmir; * Təhsil müəssisələri özlərinin klassik məqsədlərini dəyişir. Daha çox sahibkarlıq, biznes qaydalarına meyillidirlər, daha çox gəlir əldə etmək üçün müxtəlif modelləri sınaqdan çıxarırlar; * Sənaye ilə münasibətlər dəyişir. Təhsil müəssisələrinin "əmək bazarına çıxış imkanı veririk" kimi illüzuyaları boşa çıxır, sənayenin və cəmiyyətin tələblərinə uyğun, əmək bazarında dayanıqlı fəaliyyət göstərən, daxili rəqabətdə qalib çıxan kadrlar yetişmir. Əksər müəssisələr kadrlarını özləri yetişdirir, təlimlər və müxtəlif metodlarla bacarıqlarını artırır. Sənaye ilə təhsil müəssisələrinin münasibətləri çox zəifdir. Beləliklə, təhsil müəssisəsi yüksək standartlarını və qarşılıqlı münasibətləri saxlamaqla daha effektiv yanaşma tətbiq etməlidir. Bütün bunları isə tələbələrə xidmət spektrini genişləndirməklə və təhsil xərclərini artırmadan edilməlidir. Dəyişikliyi zəruri edən sonuncu- üçüncü amilə nəzər yetirsək, görərik ki, təhsilin klassik məqsədinin dəyişməsi və innovasiyalara qeyri-çevik reaksiya bu günün təhsilində əsas problem olaraq qalır. Dəyişikliklərə qeyri-çevik reaksiya əvəzinə təhsil idarəçiləri və təhsil müəssisələri müxtəlif uzunmüddətli strategiyalar hazırlayır, davamlı innovativ yanaşmalar təqdim edirlər. Bunlar yaxşıdır, lakin bunları hazırlayan zaman nəzərə almaq lazımdır ki, təhsilin klassik məqsədləri qorunsun, bir sözlə, bu innovasiyalar və uzunmüddətli planlar təhsilin klassik məqsədini dəyişməyə yönələrsə, əksər hallarda ona dağıdıcı təsir göstərər.Qeyd olunduğu kimi, "dünən də", "bu gün də" hər kəs qəbul edir ki, təhsilin məzmunu və təhsilə yanaşma dəyişməlidir. Bəs, bu dəyişiklik necə olmalıdır? Nəyi dəyişməliyik? Bu suallara düzgün cavab vermək üçün, ilk növbədə, təhsilin əsl məqsədinin nə olduğunu, onun fəlsəfəsini düzgün təsvir etmək lazımdır. Təhsil nədir? Məqsədi nədir? kimi suallara müxtəlif ekspertlər müxtəlif cavablar verirlər. Hər bir ölkənin təhsil sistemi onun milli-mənəvi dəyərlərinə, milli maraqlarına cavab verməklə bərabər həm də qlobal çağırışlara cavab verməli, dünya təhsil sisteminə inteqrasiya olunmalıdır. Bu günün təhsili həmçinin klassik təhsildən onunla fərqlənir ki, bu gün insanlar təhsil alıb, ömürlərinin sonuna qədər onu istifadə edə bilmirlər, təhsil bu günün insanlarının heç vaxt tamamlaya bilməyəcəyi bir prosesdir, bu prosesdə daim yeniliklər və dəyişikliklər baş verir, bu dəyişikliklər bizi məcbur edir ki, biz təhsilimizi daimi yeniləyək və dəyişikliklərə çevik cavab verə bilək. Bəzi müəlliflərin fikrincə, təhsil sisteminin əsas məqsədi gələcəyin rəqabətə davamlı işçi qüvvəsinin hazırlanması və insanları əmək bölgüsündə iştiraka hazırlamaq olsa da, təhsil həm də şəxsiyyətin bilik, bacarıq, vərdişlər və səriştələrini və həmçinin mənəvi, sosial və yaradıcılıq potensialını formalaşdırır. "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanununda təhsilin məqsədi üç maddədə göstərilmişdir. Bunları qısaca olaraq - milli-mənəvi dəyərlərə malik vətəndaş yetişdirmək, müasir təfəkkürlü və rəqabət qabiliyyətli mütəxəssis-kadrlar hazırlamaq, təhsilalanları ictimai həyata və səmərəli əmək

fəaliyyətinə hazırlamaq kimi ümumiləşdirmək olar. Təhsil fəlsəfəsi isə bir qrupun (təhsilverənlər) bilik və dəyərlərinin digər qrupa (təhsilalanlara) ötürülməsi prosesidir. Bu proses zamanı isə hər iki tərəf qarşılıqlı olaraq bir-birinin dəyişməsinə təsir göstərir. Təşkilati baxımından isə buna davranış dəyişikliyi deyilir. Başqa sözlə, təhsilin məqsədi – təhsilalanların davranışının dəyişməsidir. Davranışda dəyişiklik baş verməsi üçün isə tədris-təhsil mühiti və təhsilin məzmunu dəyişməlidir. * Təhsilverənlərin rolunun dəyişməsi: Məqalənin əvvəlində də qeyd olunduğu kimi, təhsilalanlar dəyişib, sosial şəbəkələrdən istifadə bu günün tələbələrini daha çox məlumatlı edib, onların təhsilverənlərdən asılılığı azalıb, demək olar ki, təhsilalanlar və təhsilverənlərin məlumata əlçatanlığı eyni səviyyədədir. Deməli, təhsilverənlərin rolunun yenidən nəzərdən keçirilməsinə ehtiyac vardır. Ümumiyyətlə isə professor Ş.Əsgərovun sözü ilə desək, təhsilə yanaşma və ümumi halda təhsil fenomeninə baxış, xüsusi halda təhsilverənə və təhsilalana münasibət dəyişməlidir. Artıq klassik "dərs deyən" anlayışı yoxa çıxır, təhsilverən daha çox istiqamət verir, mentor rolunda çıxış edir, təhsilalanı yönəldir, individual yanaşır, daha çox nəyi öyrənməli olduğu, necə öyrənməli olduğu barədə istiqamətləndirir; * Təhsildə məsuliyyət bölgüsü yenidən formalaşır: Təhsil prosesi çoxtərəfli bir prosesdir. Bu prosesin bir tərəfində təhsilverənlər, təhsil idarəçiləri durursa, digər tərəfində cəmiyyət, icma və valideynlər durur. Təhsilin məsuliyyəti isə bu tərəflər arasında bölünməlidir. Təhsildə məsuliyyət ancaq təhsil sisteminin və təhsilverənlərin deyil, həmçinin valideynlər və cəmiyyətin arasında bölünməsi məqsədəuyğundur; * Təhsilverənlər və təhsil strukturunun daha sürətlə dəyişməsi: Kütləvi informasiya vasitələrindən məlumat axını indiyə qədər olmamış dərəcədə əlçatandır. Bu isə yaradıcılıq məşğələləri üçün sonsuz imkanlar yaradır. Bu imkanlara malik təhsilalanlar isə uzun illər dəyişməz qalan təhsilə, norma standartlarına uyğunlaşmış dərslərlə, mühazirələrlə vaxt itirmək niyyətində deyillər. Bu ziddiyyət isə özlüyündə innovasiyaları və "qocalmış" (və ya köhnəlmiş) normaları, ənənələri pozmağı digər bütün məsələlərdən üstün edir. Yeni rəqəmsal informasiya imkanları istənilən biznesdə və müəssisədə idarəetmə sisteminin, strukturunun dözülməzliyini və bununla da dəyişməyə və ya məhvinə zəmin yaradır. Deməli, təhsilalanlar daha sürətlə, daha yaradıcı düşünmə qabiliyyətlərinə yiyələnirlər. Bu isə özlüyündə təhsilverənlərin və təhsil strukturunun da eyni sürətlə dəyişməli olduğu tələbəni gündəmə çıxarır. * Kommunikativ bacarıqların verilməsinin daha önə çıxarılması: İnsan sosial varlıqdır, sosial şəbəkələrin yaratdığı imkanlar təhsilalanların kommunikasiya imkanlarını məhdudlaşdırır, insanlar daha çox displeylə vaxt sərf edir, müzakirələr, yaradıcılıq görüşləri kimi kommunikasiyaya ayrılan vaxt azalır. Bu isə özlüyündə təhsilverənlərin kommunikasiya bacarıqlarını və imkanlarının artırılmasını, müxtəlif platformalar üzərindən yaradıcılıq və müzakirələr üçün mühitin formalaşdırılmasına ehtiyacı müəyyənləşdirir; * Kritik və yaradıcı düşünmə bacarıqlarının və bunun üçün müvafiq tədris mühitinin formalaşdırılması: Məlumat əlçatanlığı asan və ucuz olanda onların təhlili və düzgün qərar verilməsinin əhəmiyyəti artır. Təhsilverənlərin məlumatların alınması və təhlili texnologiyalarını, doğru qərarın verilməsi yollarını öyrədən tədrisə daha çox önəm verilməsi məqsədəuyğundur; * Təhsilin mövcud tələblərə uyğun transformasiyası: Təhsil qlobal tələblər əsasında məzmun və məqsədini formalaşdırır. Təhsil həmçinin hər bir ölkənin strateji sahəsidir və milli maraqlara, dövlətçiliyə xidmət etməlidir. Qloballıq və milli maraqlar bəzi hallarda ziddiyyət təşkil edir, təhsil sisteminin milli maraqları, ənənələri qorumaqla bərabər qlobal çağırışlara daha çevik reaksiya verən bir sistem kimi formalaşması məqsədəuyğundur. Qeyd etdiklərimiz dünya təhsil sistemində günün tələblərinə cavab vermək üçün tələb olunan əsas çağırışlardır. Dövlət olaraq biz də öz təhsil sistemimizi bu tələblərə uyğun qurmalı, bu çağırışlara cavab verən vətəndaş yetişdirməliyik. Hər bir ölkədə olduğu kimi, Azərbaycan da öz təhsil sistemini beynəlxalq çağırışlara cavab verən və ölkənin prioritetlərinə uyğun qurmalıdır. Belə olan halda Azərbaycan təhsilinin, Azərbaycan müəlliminin qarşısında hansı xüsusi vəzifələr durur? Azərbaycan təhsili hansı tələblər əsasında vətəndaş yetişdiməlidir?

2021-ci ildə 100 yaşını qeyd edəcək Azərbaycan Dövlət Pedaqoji Universiteti "ADPU-2021 Strateji İnkişaf Planı"nda öz missiyasını pedaqoji sahədə təhsil və tədqiqatın əsas mərkəzi olmaq kimi ifadə etmişdir. XXI əsrdə dünyada elm və təhsilin sürətlə dəyişdiyi cari inkişaf şəraitində Azərbaycan müəlliminin vəzifələrini düzgün müəyyən etmək baxımından bu missiyaya doğru istiqamətlənmiş yolda aşağıdakı vəzifələrin yerinə yetirilməsi nəzərdə tutulur: * Təhsilalanlara Azərbaycan, dövlət, tarix sevgisi aşılanmalı: Azərbaycan Respublikasının gələcək fəal vətəndaşları kimi milli kökə, milli tarixə bağlılığı ilə, buraxılmış səhvlərə görə dərs çıxarmış, uğurlarla arxayınlaşmamış insanlar kimi formalaşdırılmalıdırlar; * Təhsilalanların milli mənlik süzgəcindən keçməsi: Təhsilalanların gələcək dünya üçün bilməli olduğu məzmunu müəyyən edərkən Azərbaycançılıq süzgəcindən keçirməli, millətinə sevgisi valideynlərinə sevgidən, torpağa sevgisi böyüdüyü məhəlləyə sevgidən başlamalı və bütün milli-mənəvi sərhədlərimizədək uzanmalıdır; * Təhsilalanlar öz ölkəsinin quruculuğuna xidmət etməli: Təhsilalanlar dünyanın nailiyyətlərini bilməli, istifadə etməli, amma ona aludə olmamalı, onun yaradıcılarına çevrilmək eşqi ilə yaşamalı, qabaqcıl cəmiyyət və dövlətlərə düşkün olmamalı, o reallıqları öz ölkəsində yaratmağın yollarını axtarmağa sövq edilməlidirlər; * Vətən sevgisi və müstəqil öyrənmə bacarıqlarının formalaşdırılması: Bizim hər şeyi öyrətməyə zamanımız olmayacaq. Biz onlara 2 şeyi mütləq öyrətməliyik, bir-vətən, torpaq və dövlət sevgisini və iki-müstəqil öyrənmə bacarığını;* Rəqəmsal biliklər və xarici dil bacarıqlarının verilməsi: Mütləq iki bacarığı da yeni nəslə aşılamalıyıq. Bunlardan birincisi tələb olunan minimum digital biliklər, ikincisi isə gözəl və zəngin ana dilindən sonra ikinci xarici dili- dünyanın elm dili, texnologiya dili olduğu üçün ingilis dilini mütləq öyrətməliyik. Mənəvi-milli kök üzərində rəqəmsal bilik, bacarıqlar və dünyaya çıxış üçün ingiliscə, maraqlanacağı məzmunu əldə etməsi üçün dünyagörüş, maraq dairəsi – bax bu, bizim milli təhsilin profilini formalaşdırmağa kömək edəcək yönlərdir.

**Cəfər Cəfərov**
**ADPU-nun rektoru, professor**
**İsrayıl İsgəndərov**
**ADPU nəzdində ADPK-nın direktoru, dosent**

## ADPU-da 2 Fevral-Gənclər Günü münasibətilə görüş

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov 2 Fevral-Gənclər Günü münasibətilə universitetin bir qrup fəal tələbəsi ilə görüşüb. Görüşdə Sosial və humanitar məsələlər üzrə prorektor professor Fikrət Rzayev, ADPU YAP Gənclər Birliyinin sədri Cavid Hüseynov iştirak edib. Görüşdə 2019-cu ildə universitetin ictimai fəaliyyətində fəal iştiraklarına görə 2 Fevral-Gənclər Günü münasibətilə fərqlənən tələbələr Fəxri fərmanla təltif ediliblər. Tələbə-gənclər onlara göstərilən diqqət və qayğıya görə ADPU-nun rəhbərliyinə təşəkkür edərək yüksək səviyyəli mütəxəssis və əsl vətəndaş kimi yetişmək üçün əzmlə çalışacaqlarını bildiriblər. Sonda xatirə şəkli çəkdirilib.




## Murovun o üzü bizim Vətəndi



Ağlamaqla dərdə çarə tapılmaz,
Torpaq basılanda gözləmək olmaz,
Qiyamətə şəhid qisası qalmaz,
Çətin günlər gəldi-gedər, ötəndi.
Murovun o üzü bizim Vətəndi.

Göyqurşağı salır günün ziyası,
Gül-çiçək qoxuyur təmiz havası,
Cənnətməkan, min bir dərdin davası,
Dağın yaraşığı dumandı, çəndi,
Murovun o üzü bizim Vətəndi.

Haylasan qayalar əks edər səsi,
İnsana ruh verər gur şəlaləsi,
Bulaqların zümzüməsi, nəşəsi,
Unudulmur, yaddan çıxmır nədəndi?!
Murovun o üzü bizim Vətəndi.

Bir yanı Göyçədi, bir yanı Laçın,
Silaha sarılıb yurda yol açın!
Köçkünlərə müjdə verməyə qaçın,
Deyin ki, basılan qarı düşməndi.
Murovun o üzü bizim Vətəndi.

Vaxt gələr qələbə çalar ordumuz,
Azadlığa çıxar doğma yurdumuz.
Yenilməz aslana dönər qurdumuz,
Dağlar düşmənin bərəsi, bəndi.
Murovun o üzü bizim Vətəndi.

Geriyə dönməyə ümidimiz var,
Gözləyirik keçir necə qış, bahar,
İnşallah həyata keçər arzular,
Mirvari, uzaqdan bir səda dindi,
Murovun o üzü bizim Vətəndi.

**ADPU-nun Azərbaycan Coğrafiyası və coğrafiyanın tədrisi texnologiyası kafedrasının dosenti, Kəlbəcərli şairə Mirvari Verdiyeva**

## ADPU-da Litva Respublikası Parlamentinin nümayəndəsi ilə görüş keçirilib



Fevralın 20-də Litva Respublikası Parlamentinin nümayəndəsi Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) qonağı olub. Görüşdə Parlamentin Elm və Təhsil üzrə Komitə üzvü Gintaras Steponavicius, ADPU-nun Tədris işləri üzrə prorektoru Eldar Aslanov, Sosial və humanitar məsələlər üzrə prorektoru Fikrət Rzayev, Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə və Beynəlxalq əlaqələr şöbəsinin əməkdaşı Günay Məhərrəmova iştirak edib. Görüşün məqsədi ADPU-nun beynəlxalq əlaqələrinin inkişaf etdirilməsi, bu istiqamətdə görülə biləcək işlərə və mümkün əlaqələrin qurulmasına dəstəyin müzakirəsi olub. Qonağı salamlayan prorektor Eldar Aslanov universitetin profili, strukturu və tədris prosesi haqqında məlumat verib. ADPU əməkdaşlarının layihə çərçivəsində Litvanın SMK Sosial Elmlər Kollecinə səfəri, əməkdaşlıqda cari vəziyyət, əlaqələrin ali təhsil müəssisəsinin beynəlmiləlləşməsinə və təhsilin keyfiyyətinə təsiri barədə geniş danışan E.Aslanov qonağın Azərbaycanda müəllim hazırlığı siyasəti ilə bağlı suallarını da cavablandırıb. ADPU-nun beynəlxalq əlaqələrindən bəhs edən prorektor Nigar Abbaszadə Litvanın ali təhsil müəssisələri ilə əlaqələrdən, ERASMUS+ KA1 proqramı çərçivəsində görülə biləcək işlərdən danışaraq İnkluziv təhsil ilə bağlı layihələrdə Litva ali təhsil müəssisələri ilə əməkdaşlığın əhəmiyyətini qeyd edib. Qonaq Litvanın Azərbaycan ali təhsil müəssisələri ilə əməkdaşlığa açıq olduğunu qeyd edib. O, eyni zamanda ADPU-nun əməkdaşlıq etdiyi Vytautas Magnus Universiteti və SMK Sosial Elmlər Kollecinin Litvadakı nüfuzundan bəhs etmiş, əməkdaşlıqların sayının artırılması və inkişafı üçün lazımi dəstəyi göstərəcəyini qeyd edib.

## ADPU-da "Fəryad edən Xocalı" adlı anım tədbiri

Fevralın 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Sosial və humanitar məsələlər üzrə prorektorluq və Tələbə Gənclər Təşkilatının təşkilatçılığı ilə Xocalı soyqırımının iyirmi səkkizinci ildönümünə həsr olunmuş "Fəryad edən Xocalı" adlı anım tədbiri keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, professor-müəllim heyəti və tələbələri iştirak edib. Tədbirdə ilk olaraq Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib, Xocalıda həlak olmuş soydaşlarımızın və Vətən uğrunda mübarizədə canlarından keçmiş şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Tədbirdə Xocalı faciəsi ilə bağlı tələblərin hazırladıqları videoçarxlar və Xocalı faciəsini əks etdirən ədəbi-bədii kompozisiya təqdim olunub.



## ADPU-da Azərbaycan həqiqətlərinin tanıdılmasında diasporanın roluyla bağlı elmi –praktiki videokonfrans




Mayın 7-də Azərbaycan Dövlət Pedagoji Universitetinin (ADPU) Azərbaycan tarixi kafedrasının və Azərbaycan Respublikasının Diasporla İş üzrə Dövlət Komitəsinin birgə təşkilatçılığı ilə "Beyin qazanma proqramı" çərçivəsində "Azərbaycan torpaqlarının Ermənistan tərəfindən işğalı və Xocalı Soyqırımının tanınmasında Diasporanın rolu" adlı elmi - praktiki videokonfrans keçirilib. Video-konfransda Türkiyə - Azərbaycan Dostluq, Əməkdaşlıq və Həmrəylik Fondunun sədri, prof. Aygün Attarın mühazirəsi dinlənilib, mövzu ilə bağlı ADPU-nun Azərbaycan tarixi kafedrasının müdiri dos. Naibə Əhmədova, prof. Xaqani Məmmədov, dos. Mübariz Ağalarovun, t.ü.f.d. Habil Həsənovun, dosent Zakir Kərimov, həmçinin fakültə tələbələrinin birgə müzakirələri ilə konfrans işini davam etdirib. Sonda Azərbaycan diasporu və professor Aygün Attarın ADPU ilə gələcəkdə elmi əməkdaşlığına dair bir sıra təkliflər irəli sürülüb.

## ADPU-dan Koronavirusla Mübarizəyə Dəstək Fonduna ianə

Azərbaycan Dövlər Pedaqoji Universiteti Azərbaycanda koronavirusun geniş yayılmasının qarşısının alınması istiqamətində dövlət tərəfindən həyata Azərbaycan Dövlər Pedaqoji Universiteti Azərbaycanda koronavirusun geniş yayılmasının qarşısının alınması istiqamətində dövlət tərəfindən həyata keçirilən tədbirlərə töhfə olaraq Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin Fərmanı ilə yaradılmış Koronavirusla Mübarizəyə Dəstək Fonduna 50 000 manat məbləğində ianə edib.

## ADPU-da AXC ilə bağlı beynəlxalq onlayn elmi konfrans keçirilib

Mayın 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) "Ümumi tarix və tarixin tədrisi texnologiyası" kafedrasının təşəbbüsü və təşkilatçılığı, Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasının "Tarix" kafedrasının dəstəyi ilə Respublika Günü münasibətilə videokonfrans formatında "Azərbaycan Xalq Cümhuriyyətinin beynəlxalq səviyyədə tanınması: tarixin dərsləri" adlı beynəlxalq onlayn elmi konfrans keçirilib. Konfransı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov iştirakçıları Respublika Günü münasibəti ilə təbrik edərək, bu günün tariximizdə oynadığı böyük rolu vurğulayıb, konfransın işinə uğurlar arzulayıb. Fəxri qonaqlar - Türkiyə Cümhuriyyətinin Bakıdakı Səfirliyinin Təhsil üzrə müşaviri Dr.Nihat Büyükbaş, Kazak-Türk Universitetinin rektoru prof.dr. Cengiz Tomar, İstanbul Universitetinin Ədəbiyyat Fakültəsinin dekanı Prof.Dr. Hayati Develi qardaş Azərbaycanı Respublika Günü münasibəti ilə təbrik ediblər.Konfransda ADPU-nun "Ümumi tarix və TTT" kafedrasının müdiri dos. Sevinc Əliyeva, Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasının Siyasi idarəetmə fakültəsinin dekanı s.e.d. Elçin Əhmədov və həmin DİA-nın "Tarix" kafedrasının müdiridos. Firdovsiyyə Əhmədova, Türkiyə Cümhuriyyətin İstanbul Universitetinin professorları - prof.dr. Mehmet Ali Beyhan, prof.dr. Halil Bal, BDU-nun Azərbaycan tarixi (Təbiət fakültəsi üzrə) kafedra müdiri dos. Azad Rzayev, AMEA-nın A.A.Bakıxanov adına Tarix İnstitutunun "Azərbaycan Xalq Cümhuriyyəti" şöbəsi dos. Kamran İsmayılov, AMEA-nın Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun a.e.i. Aytən İmanova və b. məruzə ilə çıxış ediblər.Konfransda ADPU-nun "Ümumi tarix və TTT" kafedrasının müdiri t.e.d.Sevinc Əliyevanın "Азербайджанская Демократическая Республика и государства Северного Кавказа" və "Azərbaycan Xalq Cümhuriyyəti və Şimali Qafqaz dövlətləri müstəqillik illərində (1918-1920)" adlı rus və azərbaycan dillərində nəşr edilmiş kitablarının təqdimatı da keçirilib.

## ADPU "Ali təhsil müəssisələrinin sərgisi"ndə iştirak edib

Fevralın 23-də "Sabunçu Gənclər Evi"ndə "Ali təhsil müəssisələrinin sərgisi" keçirilib. Sərgidə Bakı məktəbliləri iştirak edib. Məqsəd abituriyentlərin seçiminə uyğun ali təhsil müəssisələri ilə tanış olmağına və universitet nümayəndələri ilə birbaşa ünsiyyətdə olaraq suallarına cavab tapmağına dəstək olmaqdır. Sərgidə iştirak edən universitetlər arasında Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) öz fərqliliyi ilə seçilib. ADPU-da qonaq olan tanınmış iranlı rəssam Sahra Paseban universitetin şəklini çəkərək sərgiyə rəngarənglik qatıb. Sonda Sabunçu Gənclər evinin direktoru Samir Mehralıyev təşəkkürnaməyə layiq görüldüyünü elan edib.



## Zəfəri inşa edən MÜƏLLİMLƏRİMİZ

ADPU-nun Şəhid tələbə və məzunları Müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə Şanlı Azərbaycan Ordusunun doğma diyarımızın ərazi bütövlüyünü bərpa etdiyi Vətən müharibəsində cəmiyyətin bütün təbəqələrindən olan minlərlə insan "Öncə Vətən!" deyərək cəbhəyə yollandı. Zəfərlə başa çatan döyüşlərdə təəssüf ki, 2855 igidimiz Şəhid oldu. Müqəddəs Şəhidlik zirvəsinə ucalan oğullarımızdan 11 nəfəri məhz Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) tələbə və məzunlarıdır. Qəhrəman müəllimlərimizi sizə təqdim edirik:




1. Leytenant Orxan Rza oğlu Nəbiyev – 2012-2016-cı illərdə ADPU-nun Şamaxı filialının "Azərbaycan dili və ədəbiyyat müəllimliyi" ixtisasında ali təhsil alıb. Oktyabrın 14-də Suqovuşanda Şəhid olub.




2. MAXE İlkin Saməddin oğlu Ağaquliyev – 2017-ci ildə ADPU nəznində ADPK-nın "Fiziki tərbiyə müəllimliyi" ixtisasına qəbul olmuş, 2018-ci ildə təhsilini yarımçıq qoyaraq hərbi xidmətə yollanmışdır. Oktyabrın 16-da Suqovuşanda Şəhid olub. 2021-ci ilin yanvar ayının 8-də ADPU nəzdində ADPK-da Qarabağ müharibəsində şəhid olmuş məzunlarının xatirəsini əbədiləşdirmək məqsədi ilə "Qəhrəmanlıq Zirvəsi" auditoriyası açılıb.




3. Baş leytenant Elgün Elman oğlu Əzizov – 2007-2011-ci illərdə keçmiş AMİ-nin Şamaxı filialında (ADPU-nun Şamaxı filialı) "Azərbaycan dili və ədəbiyyat müəllimliyi" ixtisasında təhsil alıb. Oktyabrın 6-da Füzuli istiqamətində Şəhid olub.




4. Hərbi tibb qulluqçusu çavuş Arəstə Kərim qızı Baxışova – 2004-2008-ci illərdə ADPU nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin (ADPK) "İngilis dili müəllimliyi" ixtisasında təhsil alıb. Oktyabrın 23-də Qubadlıda Şəhid olub.




5. Firdovsi Balaxan oğlu Tahirov – 2015-2019-cu illərdə ADPU-nun "Tarix müəllimliyi" ixtisasında təhsilalıb. Sentyabrın 27-dən 28-nə keçən gecə Murovdağda Şəhid olub.




6. Qoşqar Səxavət oğlu Ömərov – 2011-2015-ci illərdə ADPU-nun "Riyaziyyat müəllimliyi" ixtisasında, 2016-2018-ci illərdə isə Azərbaycan Memarlıq və İnşaat Universitetinin "İnformasiya texnologiyaları" ixtisası üzrə magistraturasında təhsil alıb. Noyabrın 4-də Daşaltı kəndinin ətrafındakı döyüşlərdə Şəhid olub.




7. Baş leytenant Etiram Həsən oğlu Hüseynli – 1994-1998-ci illərdə N.Tusi adına Azərbaycan Pedaqoji İnstitutunun (ADPU) "İlkin hərbi və fiziki təlim" fakültəsində təhsil alıb. Oktyabrın 21-də Qubadlıda Şəhid olub.




8. Baş leytenant Ağaqardaş İlham oğlu Abbasov – 2009-2013-cü illərdə ADPU-nun Ağcabədi filialının "Azərbaycan dili və ədəbiyyatı müllimliyi" ixtisasında təhsil alıb. Sentyabrın 28-də Füzuli döyüşlərində şəhid olub.




9. Ceyhun Aqil oğlu Nüsrətli – 2012-2016-cı illərdə ADPU-nun "Kimya müəllimliyi" ixtisasında təhsil alıb. Sentyabrın 29-da Ağdərə döyüşlərində şəhid olub.




illərdə ADPU nəznində ADPK-nın "Texnologiya müəllimliyi" ixtisasında təhsil alıb. Oktyabrın 27-də Qubadlı döyüşlərində Şəhid olub.




11. Rəvan Ömür oğlu Lətifov – 2008-2012-ci illərdə ADPU-nun "Təhsilin təşkili və idarə olunması" təhsil alıb. Noyabrın 6-da Daşaltı-Şuşa istiqamətində Şəhid olub.



## Əsrə bərabər günlərə şahid olduq



*ADPU-nun Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynovanın noyabrın 11-də şanlı Zəfərimizlə bağlı Azərbaycan Dövlət İnformasiya Agentliyində (AZƏRTAC) yayımlanan müsahibəsini sizə təqdim edirik.*

Tarixdə elə günlər var ki, onu əsrə bərabər hesab edirlər və 2020-ci il noyabrın 10-u belə gün kimi Azərbaycan xalqının tarixinə düşdü. Bu, ona görə əsrə bərabər gün kimi tariximizdə qalacaq ki, əsrin üçdə biri qədər müddətdə zorla, ölüm təhdidi altında çıxarıldığımız, şərəf hissindən məhrum düşmənin maddi və mənəvi abidələrimizi dağıtdığı, müqəddəs inanc yerlərimizi təhqir etdiyi, Azərbaycan izinin silinib yox edilməsi prosesi getdiyi ərazilərimiz dövlətimizin yurisdiksiyasına keçdi, gözəl Qarabağımıza və ətraf yeddi rayona qayıtmaq imkanı qazandıq. Bu, ona görə tariximizə əbədi həkk edilən gün oldu ki, böyük bir xalqın inamı özünə qayıtdı, tarixin müəyyən məqamlarında hər bir millətin düşə biləcəyi burulğandan ləyaqətlə çıxdı, öz gücünə, potensialına bir daha inandı. Ötən 44 günün Azərbaycan dövlətçiliyi tarixində xüsusi mərhələ kimi qalacağını isə ona görə qətiyyətlə deyirik ki, həmin günlər xalq-dövlət, xalq-hakimiyyət birliyinin şanlı səhifələri yazıldı. Dünya tarixində az-az dövlətlərdə təsadüf olunan oxşar situasiya formatı tapmaq olar ki, bu cür monolit birlik praktikası ilə qarşılanasan. Bu, hakimiyyət və xalq arasında qarşılıqlı inam və etimadın nə qədər vacib olduğunun göstəricisi oldu. Xalq və dövlətimizin Dağlıq Qarabağda perspektivinə inandığımız, düşməni əbədi sülhü bərqərar edən sənədə qol çəkdirmək gücünün başlıca amili olan bu göstərici hər bir Azərbaycan Respublikası vətəndaşı üçün qürurvericidir. Professor deyir: "Baş vermiş hadisələrin xronologiyasını xəyali gözdən keçirmək kifayət edər ki, bu tandemdə siyasi hakimiyyət, şəxsən Prezident İlham Əliyevin səmimiyyətə söykənən siyasəti nə qədər böyük rol oynadı. Cəbhə xəbərləri ilə bağlı Azərbaycan Respublikası Müdafiə Nazirliyi tərəfindən yayılan məlumatların ölkə əhalisində heç bir tərəddüd yaratmadan qəbul edilməsinin köklərini də həmin səmimiyyətdə axtarmaq lazımdır. Hamımız xatırlayırıq ki, Şuşa ətrafında gedən gərgin döyüşlərdən sonra, noyabrın 8-də Prezident İlham Əliyev televiziya ilə xalqa müraciət etdi, Azərbaycan ruhunun paytaxtı, xalqımızın simvolu olan şəhərin azad olunması xəbərini verdi.
Sentyabrın 27-dən başlayan və noyabrın 10-na qədər davam edən müharibə parlaq Azərbaycan gəncliyinin öz şərəfli tarixinin kökləri üzərində boy atdığını bir daha bütün dünyaya göstərdi. O köklərin nəticəsi idi ki, bizim qəhrəman balalarımız müharibənin başlanğıcında "keçilməz sədd" mifi qazandırılan "Ohanyan istehkamları"nı yarıb keçdilər və hesab edirəm ki, hərb tarixində unikal səhifələr kimi yazılan Şuşanın azad edilməsi əməliyyatını tədqiq edəcək tarixçiləri belə heyrətləndirəcək ağlagəlməz rəşadət göstərdilər. O səhnələr şəxsən məni bir insan kimi heyrətləndirir, bir ana kimi mütəəssir edir və hesab edirəm ki, bədii ədəbiyyatımızın əbədi mövzusuna çevriləcək o anları yaşatmaq hər birimizin borcudur".

## Beynəlxalq videokonfrans: "COVİD-19 və onun təhsildə yaratdığı problemlərin həlli yolları"

Avqustun 8-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tarix və coğrafiya fakültəsinin təşkilatçılığı ilə ABŞ-ın Azərbaycan Diaspora nümayəndələri ilə birgə Zoom platformasında keçirilən konfransda 100-ə qədər tələbə və professor-müəllim heyəti iştirak edib. ADPU-nun Tarix və coğrafiya fakültəsinin dekan müavini dos. Mətanət Əsgərovanın moderatorluğu ilə keçirilən konfransda ADPU-nun Tədris işləri üzrə prorektoru dos. Eldar Aslanov, Corc Vaşinqton Universitetinin Proqram direktoru doktorant Sevinc Məmmədova, Şimali Dakota Dövlət Universitetinin maliyyə professoru Fariz Hüseynov və Deloitte şirkətinin Vaşinqton ofisinin İnformasiya Texnologiyaları üzrə baş mütəxəssisi Aytən Əliyeva çıxışlar ediblər. Dos. E. Aslanov ADPU rəhbərliyi adından qonaqları salamlayıb, ADPU-nun bu çətin dönəmdə imkanları daxilində maksimum çevik reaksiya verdiyini və hazırda da bütün hallara qarşı lazımi tədbirlər üzərində işlənildiyini, lakin bununla belə bu sahədə dünya xüsusilə ABŞ və digər ölkələrin təcrübəsinin öyrənilməsinin vacib olduğunu qeyd edib. Spikerlər, S. Məmmədova "Pandemiya dövründə Corc Vaşinqton Universitetində onlayn tədrisin təşkili", F. Hüseynov "Şimali Dakota Dövlət Universitetində Covid-19-la bağlı tətbiq olunan tədbirlər sistemi", A.Əliyeva isə "Onlayn təhsildə proqram təminatları və onların təhlükəsizliyi məsələləri" mövzularında ətraflı çıxışlar edərək ABŞ universitetlərinin təcrübələrini bölüşüblər.



## MİQ-2020-də də ADPU məzunları öndədir

2020-ci ildə keçirilən Müəllimlərin işə qəbulu (MİQ) imtahanlarında Azərbaycan Dövlət Pedaqoji Universitetinin və onun filiallarının (ADPU) 100-lərlə tələbəsi mümkün 60 baldan 50-dən çoxunu toplamışlar. Belə ki, təkcə İbtidai təhsil fakültəsinin məzunlarından 72 nəfər 50 baldan çox nəticə göstərib. Məzunlarımızı təbrik edirik.













## ADPU-nun rektoru professor Cəfər Cəfərov Türkiyənin Ali Təhsil Keyfiyyət Şurasının Xarici Qiymətləndiricisi (ekspert) seçilib.



Qeyd edək ki, Türkiyədə ali təhsildə keyfiyyət təminatından məsul yeganə dövlət qurumu olan Ali Təhsil Keyfiyyət Şurasının (YÖKAK) fəaliyyət strategiyası ali təhsildə keyfiyyət təminatı sisteminin qurulması, ali təhsil müəssisələrində bu sistemin inkişafına dəstək verilməsi, keyfiyyət mədəniyyətinin yayılmasının təşviqi və maraqlı tərəflər arasında əməkdaşlıq edərək əlaqələrin qurulmasında körpü rolunu oynamaqdır. Qurum müxtəlif ölkələrdən keyfiyyət təminatı sahəsində təcrübəli təhsil işçilərinin bilik və təcrübə mübadiləsi çərçivəsində bir platformada fəaliyyətini təmin edir. 13 üzvü olan qurum ali təhsil müəssisələrində təlim-tədris və tədqiqat fəaliyyətləri, eləcə də inzibati xidmətlərinin keyfiyyət səviyyələrinin milli və beynəlxalq keyfiyyət standartlarına uyğun qiymətləndirilməsini, daxili və xarici keyfiyyət təminatı, akkreditasiya prosesləri və müstəqil xarici qiymətləndirmə qurumlarının inkişaf etdirilməsi proseslərini həyata keçirir.

## ADPU -da virtual sorğunun təqdimatı keçirilib

Mektebgushesi.az internet portalının ali təhsil ocaqları arasında reallaşdırdığı virtual sorğunun Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) təqdimatı keçirilib. "Tədrisin keyfiyyəti, maddi-texniki bazası və gələcəkdə işlə daha yaxşı təmin olunmaq üçün hansı universiteti seçərdiniz?" nominasiyalı virtual sorğusunun qalibi 2419 səslə Azərbaycan Dövlət Pedaqoji Universiteti olub. Təqdimatda bununla bağlı sertifikat rektora təqdim edilib. Təqdimatda ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektor Eldar Aslanov, Sosial və humanitar məsələlər üzrə prorektor Fikrət Rzayev, Təhsil Nazirliyi yanında İctimai Şuranın sədri, professor, əməkdar elm xadimi Şahlar Əsgərov, sədr müavini, təhsil eksperti Nadir İsrafilov, məsul katibi İlqar Orucov, Mektebgushesi.az saytının təsisçisi və baş redaktoru Məzahir Məmmədli iştirak edib.



# ADPU-nun məşhur məzunları

Özünün 100 illik şərəfli inkişafı dövründə Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) dünya və Azərbaycan elm və ictimai-siyasi həyatına onlarla nəhəng şəxsiyyət bəxş etmişdir. Universitetimizin adını ucaldan bu böyük şəxsiyyətlərdən beşini bu sayımızda sizə təqdim edirik.

## Əli Nağı oğlu Nağıyev



"Əli Nağı oğlu Nağıyev – Azərbaycan Respublikası Dövlət Təhlükəsizliyi Xidmətinin rəisi , general polkovnik. Əli Nağıyev 1958-ci il noyabrın 8-də Naxçıvan Muxtar Respublikasının Babək rayonunda anadan olub. 1981-ci ildə Azərbaycan Pedaqoji İnstitutunda (indiki ADPU) ali təhsil alıb. 1986-2005-ci illərdə xüsusi xidmət orqanlarında əməliyyat strukturlarında məsul vəzifələrdə xidmət etmiş, 2005-ci ildə Milli Təhlükəsizlik nazirinin müavini təyin olunmuşdur. 2011-2019-cu illərdə Baş Prokuror yanında Korrupsiyaya qarşı Mübarizə Baş İdarəsinin rəis müavini vəzifəsində işləmişdir. Azərbaycan Respublikası Prezidentinin 20 iyun 2019-cu il tarixli Sərəncamı ilə Dövlət Təhlükəsizliyi Xidmətinin rəisi təyin edilmişdir. "Zəfər ordenli" Əli Nağıyevə 27 iyunda 2019-cu ildə general-leytenant, 7 dekabr 2020-ci ildə isə general-polkovnik ali hərbi rütbəsi verilib.

## Yusif Heydər oğlu Məmmədəliyev




Yusif Heydər oğlu Məmmədəliyev (31 dekabr 1905, Ordubad, Qafqaz canişinliyi - 15 dekabr 1961, Bakı) – Azərbaycan-sovet kimyaçı alimi, kimya elmləri doktoru (1942), professor (1942), Azərbaycan SSR EA-nın akademiki (1945) və prezidenti (1947-1951 və 1958-1961), SSRİ EA-nın müxbir üzvü (1958). SSRİ Dövlət mükafatı laureatı (1946). SSRİ Ali Sovetinin (5-ci çağırış, 1958-1961) və Azərbaycan SSR Ali Sovetinin (4-cü çağırış, 1955-1959) deputatı. Yusif Məmmədəliyev 1926-cı ildə Azərbaycan Ali Pedaqoji İnstitutunu (indiki ADPU) bitirib. Nobel mükafatına namizəd göstərilən dünya şöhrətli alim II dünya müharibəsinin ağır dövründə yüksək oktanlı benzin ixtira edib, faşistlərə qarşı Sovetlərin qələbəsində onun kəşfi olan tank əleyhinə qarışığın kəşfinin çox böyük rolu olub. Hansı ki o vaxt çox adam bilirmirdi ki, məhvedici "Molotov kokteylin" müəllifi Məmmədəliyevdir.

## İsmayılzadə Mikayıl Əbdülqadir oğlu



Azərbaycanın xalq şairi Mikayıl Müşfiq (İsmayılzadə Mikayıl Əbdülqadir oğlu) 1908-ci il iyunun 5-də Bakının Xızı kəndində ziyalı ailəsində dünyaya gəlmişdir. İbtidai təhsilini rus-tatar məktəbində almış, sonra təhsilini Azərbaycan Dövlət Pedaqoji İnstitutunun dil və ədəbiyyat fakültəsində davam etdirmişdir (1927-1931). Gənc şair 7 il Bakının orta məktəblərində müəllimlik etmişdir. Son iş yeri 18 saylı Bakı şəhər orta məktəbi indi onun adını daşıyır. Yaradıcılığa 1926-cı ildə "Gənc İşçi" qəzetində çap etdirdiyi "Bir gün" şeirilə başlayan şair bədii tərcümə ilə də ciddi məşğul olur. (A.S.Puşkinin "Qaraçılar" (Ş.Abbasovla birlikdə) və M.Y.Lermontovun "Demon" poemalarını (R.Rza ilə birlikdə), Xəyyamın rübailərini, M.F.Axundovun A.S.Puşkinin ölümünə yazdığı "Şərq poeması" və s.) M.Müşfiq repressiyadan əvvəl "Çağlayan" şeirlər toplusunu tərtib etmişdi. Buraya şair ən yaxşı poetik əsərlərini də daxil etmişdi. Lakin 1937-ci ildə şair "xalq düşməni" damğası ilə həbs edilir və 1938-ci il yanvarın 6-da qısa məhkəmə ilə ölüm hökmü verilib güllələnir. "Yenə o bağ olaydı", "Oxu, tar" və bir çox başqa əsərləri Azərbaycan poeziya xəzinəsinin incilərindəndir.

## İlyas Məhəmməd oğlu Əfəndiyev



İlyas Məhəmməd oğlu Əfəndiyev – Əməkdar İncəsənət Xadimi, Dövlət mükafatı laureatı, "Şöhrət" ordenli, Xalq Yazıçısı. 1914-cü il mayın 28-də Füzuli şəhərində dünyaya göz açıb. O, 1933-cü ildə V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun (indiki ADPU) ədəbiyyat fakültəsinin əyani şöbəsinə daxil olmuş, 1938-ci ildə bu ali təhsil ocağının coğrafiya fakültəsinin qiyabi şöbəsini bitirmişdir. XX əsr Azərbaycan ədəbiyyatının əvəzolunmaz simalarından biri kimi tarixə düşmüş İlyas Əfəndiyevin zəngin nəsrinə "Söyüdlü arx", "Körpüsalanlar", "Dağlar arxasında üç dost", "Sarıköynəklə Valehin nağılı", "Geriyə baxma, qoca", "Üçatılan" və digər roman və povestləri, dramaturgiyasına "İşıqlı yollar", "Bahar suları", "Atayevlər ailəsi", "Sən həmişə mənimləsən", "Mənim günahım", "Unuda bilmirəm", "Məhv olmuş gündəliklər", "Qəribə oğlan", "Mahnı dağlarda qaldı", "Bağlardan gələn səs" və başqaları daxildir. Azərbaycan teatr poetikası bədii-estetik dəyərini geniş mənada "İlyas Əfəndiyev teatrı"nda tapmışdır. Ədib özünün "Mahnı dağlarda qaldı", "Xurşidbanu Natəvan", "Şeyx Məhəmməd Xiyabani", "Hökmdar və qızı" və digər tarixi dramları ilə xalqımızın milli azadlığı və müstəqilliyi uğrunda apardığı mübarizənin bədii tərənnümçüsünə çevrilmişdir. Cənubi Azərbaycan və mühacirət mövzularında əsərlər yazmış, "Tənha iydə ağacı" pyesi ilə ilk dəfə mühacirət mövzusunu ədəbiyyata gətirmişdir. Onun yaradıcılığı ümumilikdə səkkizinci "Qarabağnamə" adlandırılır.

## Mehdi Hənifə oğlu Hüseynzadə



Mehdi Hənifə oğlu Hüseynzadə (Mixaylo) – Sovet İttifaqı Qəhrəmanı, azərbaycanlı leytenant, partizan və İkinci Dünya müharibəsi dövründə diversiya-kəşfiyyat qrupunun rəhbəri. 1918-ci ilin dekabr ayının 22-də Bakının Novxanı kəndinə anadan olub. Əvvəlcə rəssamlıq təhsili alan və müəllim işləyən Mehdi 1940-cı ildə təhsil aldığı Leninqrad Xarici Dillər İnstitutunun Fransız dili fakültəsindən V.İ.Lenin adına Azərbaycan Pedoqoji İnstitutunun (indiki ADPU) dil və ədəbiyyat fakültəsinin II kursuna köçürülür. Bu onun poeziyaya və ədəbiyyata olan sevgisindən irəli gəlirdi. 22 iyun 1941-ci ildə Almaniya müharibə elan etmədən SSRİ-yə hücum edəndə Mehdi də ön sırada cəbhəyə yollanır. O, 1944-cü ilin noyabrın 2-də tapşırığı icra edib qərargaha qayıdarkən Vitovlye kəndində şəhid olmuşdur.

## ADPU Silahlı Qüvvələrə Yardım Fonduna ianə etdi

Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) və filiallarının əməkdaşları müzəffər Ordumuzun Azərbaycanın ərazi bütövlüyü uğrundakı uğurlu əməliyyatları ilə həmrəylik nümayiş kimi könüllü olaraq maaşlarının bir hissəsini Azərbaycan Silahlı Qüvvələrinə Yardım Fonduna ianə ediblər. Belə ki, fonda ADPU 100 000 manat, ADPU-nun filialları isə 38742 manat vəsait köçürüb. Eşq olsun Azərbaycan Ordusuna! Qarabağ Azərbaycandır!

**Oktyabr, 2020**

## Koronavirus (COVİD-19) pandemiyası şəraitində ADPU-da əcnəbilərin təhsili

COVİD-19 pandemiyası şəraitində Azərbaycan Dövlət Pedaqoj Universitetinin (ADPU) əcnəbi tələbələrlə iş sahəsində fəaliyyət davam etdirilib. Əcnəbi vətəndaşları cəlb etmək məqsədilə aparılan tədbirlər nəticəsində ADPU-da təhsil almaq üçün müraciət edən əcnəbilərin qəbulu həyata keçirilib. 2020-2021-ci tədris ilində universitetin bakalavriat səviyyəsinin müvafiq ixtisasları üzrə təhsil almaq istəyən əcnəbi vətəndaşların dil və ümumi biliklərini yoxlamaq məqsədilə ADPU-nun Müsahibə Komissiyasının Microsoft Teams platforması üzərindən onlayn iclası keçirilib. Müsahibədən uğurla keçən əcnəbilərin universitetə qəbulu rəsmiləşdirilib. 2020-2021-ci tədris ilində ADPU-nun magistratura səviyyəsinin "Pedaqogika nəzəriyyəsi və tarixi" ixtisaslaşması üzrə 3 nəfər Çin Xalq Respublikası (ÇXR) vətəndaşı, bakalavriat səviyyəsinin "Təhsildə sosial-psixoloji xidmət", "Məktəbəqədər təhsil", "Xarici dil müəllimliyi" (ingilis dili üzrə) ixtisasları üzrə 9 nəfər Türkiyə RESPUBLİKASI (TR) vətəndaşı, bakalavriat səviyyəsi üzrə əcnəbilərin hazırlıq kursuna ("Təhsildə sosial-psixoloji xidmət", "Məktəbəqədər təhsil", "Korreksiyaedici təlim", "Xarici dil müəllimliyi" (ingilis dili üzrə) ixtisaslarına) 8 nəfər TR vətəndaşı, doktorantura səviyyəsi üzrə fəlsəfə doktoru proqramına "Korreksiya pedaqogikası" ixtisasına 1 nəfər ÇXR vətəndaşı qəbul olunub. Hazırda ADPU-da Türkiyədən, Çindən, Rusiyadan, Türkmənistandan, Gürcüstandan, Suriyadan olan 100-dən çox əcnəbi tələbə müqavilə yolu ilə, Dövlətlərarası Sazişnən, DİM xətti ilə təhsil alır. Əcnəbilərin əksər hissəsi ADPU-da "Təhsildə sosial-psixoloji xidmət", "Məktəbəqədər təhsil", "Korreksiyaedici təlim" ixtisaslarında təhsil alırlar. Onların pandemiya şəraitində məsafədən təhsili təmin edilir, ödəniş və s. məsələlərdə güzəştlər tətbiq olunur.



## ADPU-da tələbələrlə onlayn görüş – "Könüllülər ilinin yekunu"




Dekabrın 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rəhbərliyi ilə 2020-ci il ərzində universitetin ictimai həyatında xüsusilə fərqlənən tələbələrin "Könüllülər ili"nin yekunu ilə əlaqədar onlayn görüşü keçirilib. Görüşdə sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, strateji inkişaf üzrə rektor müşaviri Ümid Mehdiyev və 300-ə yaxın fəal tələbə iştirak edib. Universitetin rəhbərliyi tələbələrin 2020-ci ildəki mürəkkəb situasiyada tədris və ictimai fəaliyyətini dəyərləndirib, problemlər dinlənilib və həll yolları müzakirə edilib. Görüşdə pandemiya və Vətən müharibəsi dövründə ADPU-nun ictimai təşkilatlarının fəaliyyəti xüsusi qeyd olunub, distant tədrisin təşkili və qarşıdakı imtahan sessiyası ilə bağlı tələbələrə tövsiyələr verilib, onların sualları cavablandırılıb. Sonda ictimai işlərdə xüsusi fərqlənən tələbələrin onlayn mükafatlandırılması keçirilib.

## ADPU-da I tədris ili tələbələri ilə imtahanqabağı onlayn görüşlər yekunlaşıb



Yanvarın 5-dən 3 gün ardıcıl olaraq Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rəhbərliyi universitetə cari ildə qəbul olunmuş 1000 nəfərdən artıq azərbaycanlı və türk tələbələrlə onlayn görüşlər keçirib. Görüşlərin birinci günündə 400 nəfərdən çox, ikinci və üçüncü günkü görüşlərin hər birində isə 300 nəfər tələbə iştirak edib. ADPU-nun Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin mütəxəssisi Cavid Hüseynovun moderatorluğu ilə baş tutan görüşlərdə Sosial və Humanitar məsələlər üzrə prorektor, prof. Fikrət Rzayev, Tədris işləri üzrə prorektor, dos. Eldar Aslanov, Tədris departmentinin müdiri, dos. Sənan Əliyev və Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli iştirak edib. Görüşlərdə Vətən müharibəsində Şəhid olmuş ADPU-nun 11 tələbə və məzunu və onlarla qazi tələbələri haqqında söhbət açılıb, tədrisə məsafədən başlayan birinci tədris ili tələbələrinin dünyada yaranan yeni situasiyada onlayn tədrisdə üzləşdikləri obyektiv və subyektiv çətinliklər, tədris və imtahan sessiyası, ictimai fəaliyyət, karyera və təhsil imkanları haqqında sualları cavablandırılıb, qarşıdakı onlayn imtahan sessiyasında uğurlar arzu edilib. Qeyd olunub ki, mövcud şəraitdə ADPU rəhbərliyi həmişəki kimi tələbələrin xeyrinə qərarlar qəbul etməklə distant tədrisin nəticələrinin qiymətləndirilməsində bir çox baxımdan nümunəvi pedaqoji yanaşma ortaya qoydu.

## "Tarix yazan Vətən Oğulları" - ADPU Şəhidlərinin xatirəsinə həsr olunan telekörpü

Yanvarın 10-da Bakı şəhəri, Xətai rayonu, A. Məhərrəmov adına 95 nömrəli tam orta məktəbin təşəbbüsü ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Vətən müharibəsində Şəhid olan tələbə və məzunlarınının xatirəsinə həsr olunmuş "Tarix Yazan Vətən Oğulları" adlı telekörpü baş tutub. Telekörpünün layihə rəhbəri 95 nömrəli məktəbin direktoru Elçin Abdullayev, təşkilatçıları isə direktor müavini Vüsalə Məmmədova, sinif müəllimi Zümrüd Hüseynova və 1 nömrəli Uşaq-Gənclər İnkişaf Mərkəzinin təşkilatçısı Fidan İsmayılovadır. Tədbirdə Sosial və Humanitar məsələlər üzrə prorektor professor Fikrət Rzayev, Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, mütəxəssis Cavid Hüseynov, Bakı şəhəri üzrə Təhsil İdarəsinin müdiri Mehriban Vəliyeva, idarənin ümumi təhsil sektorunun müdiri Fuad Babayev, xalq artisti Azad Şükürov, şair Baba Vəziroğlu, telejurnalist Telli Pənahqızı, ADPU-nun Şamaxı filialının direktoru Tünzalə Yusifova, filialın direktor müavini Şəlalə Seyidova, ADPU-nun Ağcabədi filialının direktor müavini Seymur Süleymanov və ADPU-nun tələbə və məzunlarından Vətən müharibəsində Şəhid olanlardan Ağaqardaş Abbasov, Elgün Əzizov və Orxan Nəbiyevin ailə üzvləri və qazilər iştirak edib.



## "İnklüziv təhsil: reallıqlar, çağırışlar, perspektivlər" adlı onlayn beynəlxalq elmi konfrans

Avropa İttifaqının maliyyə dəstəyi ilə "Regional İnkişaf" İctimai Birliyinin (RİİB) icra etdiyi "Müəllimlərin inklüziv təhsil sahəsində bacarıqlarının artırılması" layihəsi çərçivəsində RİİB, Azərbaycan Dövlət Pedaqoji Universiteti və Kanadanın Konkordia Edmonton Universitetinin birgə əməkdaşlığı ilə 17-18 dekabr 2020-ci il tarixlərində "İnklüziv təhsil: reallıqlar, çağırışlar, perspektivlər" adlı onlayn beynəlxalq elmi konfrans təşkil edilib. İctimaiyyətə açıq keçirilən ilk gündə beynəlxalq mütəxəssislərin təqdimatları dinlənilib.



## Şəhid müəllimin gələcəyin müəllimi olacaq qızı ilə müsahibə...

**44 günlük Şanlı Vətən müharibəsində düşmənə dərs, şagirdlərinə nümunə olan qəhrəman müəllimlərimizdən biri də Əvdil Quliyevdir.**

*Quliyev Əvdil Qardaşxan oğlu 1972-ci ildə Beyləqan rayonunun Təzəkənd kəndində anadan olmuşdur. Ali təsilini Kənd Təsərüffatı Akademiyasında (indiki Gəncə Dövlət Aqrar Universiteti) almışdır. Ali məktəbi leytnant rütbəsilə bitirib. 1996-cı ildə Beyləqan rayon hərbi komissarlığı tərəfindən həqiqi hərbi xidmətə çağırılmış və 1996-2000-ci illərdə Tovuz rayonunda N saylı hərbi hissədə tağım komandiri kimi qulluq edib baş leytnant rütbəsini almışdır. 2000-ci ildə ailə qurub, üç övladı var. 2019-cu ildə Beyləqan rayon Təzəkənd kənd tam orta məktəbində Hərbi Rəhbər kimi pedaqoji faliyyətə başlamışdır. 2020-ci ilin oktyabrın 1-də səfərbərliyə çağırılıb və döyüşlərə qatılıb. Füzuli, Cəbrayıl, Qubadlı, Xocavənd uğrunda gedən döyüşlərdə iştirak edib. Noyabrın 6-da Şuşa uğrunda gedən döyüşlərdə yaralı zabit yoldaşına yardım edərkən snayper gülləsi ilə yaralanmış, ayın 7-də isə Şəhid olmuşdur. Əvdil Quliyev ölümündən sonra "Vətən uğrunda" və "Şuşanın azad olunması uğrunda" medalları ilə təltif olunmuşdur. Biz bu gün qəhrəman müəllimimizin universitetimizin tələbəsi olan qızı ilə həmsöhbət olacağıq. Quluzadə Tamara Əvdil qızı Əvdil müəllimin ilk övladıdır. 2001-ci ilin noyabr ayının 7-də Beyləqan rayonunun Təzəkənd kəndində anadan olub. O hazırda Azərbaycan Dövlət Pedaqoji Universitetinin Fizika fakültəsinin III tədris ili tələbəsidir. Müəyyən axtarışdan sonra onunla əlaqə saxlaya bildik. Axşam saatları olmasına baxmayaraq bu ağır və məsuliyyətli söhbətə necə başlayacağımın həyacanı ilə Tamara xanımla internet üzərindən əlaqə qurdum. Etiraf edim ki, bu anlar mənim üçün həm qürurverici, həm də olduqca tələşlı idi...*

**Sizinlə həmsöhbət olmaq mənim üçün həm çox ağır, həyəcanlı, həm də çox şərəfli bir haldır. Siz Vətən müharibəsində Şəhidlik zirvəsinə yüksələn, Şəhidliyi ilə şagirdlərinə ən böyük nümunəni göstərən qəhrəman müəllimimiz Əvdil Quliyevin qızısınız. Bu necə bir hisdir? Millətin qəhrəmanı olan Şəhid müəllimin qızı olmağın məsuliyyəti haqda danışa bilərsiniz?**

*Atamın yoxluğu bizi çox sarsıdıb. Mən bununla heç cür barışa bilmirəm. Müəllim və üç övlad atası – bu böyük itkidir. Təsəllim onun ailəsinə və Vətənə olan sevgisi, Şəhadətə ucalan adıdır. Mənim atam Vətən uğrunda canını qurban verib. Mən onunla fəxr edirəm!*

**Atanızın məktəbdə və ailədəki davranışı, sizlərə, şagirdlərə aşıladıqları haqqında nə deyə bilərsiniz?**

*Məktəbdə işlədiyi müddətdə özünü savadlı bir müəllim kimi göstərə bilmişdi. Az vaxt içərisində həm müəllim yoldaşları, həm də şagirdləri arasında böyük hörmət qazanmışdı. Atam Vətənini, millətini canından belə artıq sevən insan idi. O, həmişə bizlərə və öz şagirdlərinə vətəni sevməyi və lazım gələrsə, onun yolunda canından belə keçməyə hazır olmağı tövsiyə edərdi.*

**Aprel döyüşləri, İyul döyüşləri, xüsusən əfsanəvi generalımız Polad Həşimovun Şəhid olması xəbəri Əvdil müəllimə necə təsir eləmişdi?**



*İstər Aprel döyüşləri, istərsə də İyul döyüşləri müharibəyə getməyə can atırdı. Şəhid generalımız Polad Həşimovun və onun zabit yoldaşlarının Şəhid olması sanki onun dincliyini əlindən almışdı. Amma hər dəfə müraciət edəndə yaşına görə müsbət cavab ala bilməməsi onu çox narahat edirdi. Vətən müharibəsinə çağırılanda sanki onun həyatında yeni bir gün başlamış kimi sevinirdi. Əynində hərbi formanı görmək, onun çoxdankı arzularının həyata keçməsi idi.*

**Vətən müharibəsinə çağırılanda sizlərə nələri tapşırdı? Döyüşlər vaxtı sizinlə danışırdımı (nələr deyirdi)?**

Müharibəyə gedərkən bizləri – anamı, məni, bacımı, qardaşımı nə qədər sevdiyinin bir daha şahidi olduq. Gedərkən hər birimizə anamızın sözlərinə, məsləhətlərinə qulaq asmağı, bir-birimizdən müğayət olmağı tapşırdı. Atam imkan olanda cəbhədən zəng edərdi. Amma bu zənglər çox qısa olardı. Heç bir vaxt harada olduğunu deməzdi. **"Hər şey yaxşıdır. Düşmənin məğlubiyyətinə az qalıb."** – deyərdi. Beyləqan raket atəşinə tutulanda anam bizi Bakıya yollamaq istəyirdi. Atam razı olmadı, dedi ki: **"Mən burdayam, narahat olmayın!"**

**Atanızın Şəhid olması xəbərini necə öyrəndiniz və necə qarşıladınız?**

*Atamın şəhid olma xəbəri – o acı xəbər noyabr ayının 7-də gəldi. Yaxınların, qohumların, sonunda isə kənd camaatının yavaş-yavaş qapımıza toplaşması o dəhşətli xəbəri özü ilə gətirdi evimizə, ailəmizə. O dəhşətli günü xatırlamaq bu gün belə çətindir.*

**Əvdil müəllimin ən böyük arzusu nə idi?**

*Atamın ən böyük arzusu, təbii ki, Vətənimizin bütövlüyü idi. Hansı ki, bu gün O, bunu öz canı və qanı ilə bərpa edənlərin sırasındadır. Atam bizim yaxşı oxumağımızı, ali təhsil almağımızı həmişə arzu edərdi. Çox yaxşı ki, mənim və bacımın (T.M. – Tamaranın özündən kiçik bacısı da bu il Gəncə Dövlət Universitetinin Texnologiya müəllimliyi ixtisasına qəbul olunub.) tələbə olduğumuzun şahidi oldu. Onun bu arzusunun yerinə yetməsi bizim üçün bir təsəllidir.*

**Tələbə yoldaşlarına, gənclərə bir Şəhid qızı kimi demək istədiklərin varmı?**

*Bir Şəhid övladı kimi həm gənclərə, həm də tələbə yoldaşlarıma onlar üçün əziz olan insanlardan ayrı olmağı arzu etməzdim. Amma ortada bir Şəhid atanın ən böyük arzusu – Vətənin azad olması varsa, hər şey bu müqəddəs amaldan sonra gəlir! Şəhadətin mübarək Ata!*

***Söhbəti apardı və müsahibəni hazırladı: Taleh MİRZƏYEV***



## Pandemiya şəraitində Quba filialı çox aktiv və adekvat faaliyyət göstərib.

ADPU-nun Quba filialı 2020-ci il ərzində pandemiya şəraitində bir çox yeniliklərə imza atıb. Onlardan ən önəmlisi regional Qafqaz TV televiziyası ilə birgə ərsəyə gətirilən "Telemühazirələr" telelayihəsidir. 2020-ci ilin mart ayından başlanan layihə çərçivəsində il boyu universitet müəllimləri tərəfindən müxtəlif ixtisaslar üzrə təqdim olunan mühazirələr həm Qafqaz TV-dən yayımlanıb, həm də internetdə yerləşdirilib. Bununla filial ölkədə yenilikçi bir formata imza atıb. Qeyd edək ki, pandemiya dövründə filialın internet resursları da tam gücü ilə fəaliyyət göstərib, elektron kitabxana sahəsində xeyli iş görülüb. Bunlardan əlavə filialın böyük layihələrindən mayın 14-də ulu öndər Heydər Əliyevin anadan olmasının 97-ci ildönümünə həsr olunmuş "Pandemiya şəraitində onlayn təhsil: reallıqlar və perspektivlər" mövzusunda beynəlxalq onlayn seminara ev sahibliyi etməsi və dünya universitetlərini bir arada toplamasını, o cümlədən noyabr ayından filial direktoru dos. Yusif Alıyevin təşəbbüsü ilə başlanan onlayn ustad dərsləri layihəsini misal göstərmək olar.







## İctimai həyat - tələbə təşkilatlarının fəaliyyəti

Əziz oxucular! 2020-ci il ərzində yaşanan bütün çətinliklərə baxmayaraq, ADPU-nun tələbələri ictimai sahədə də universitet rəhbərliyinin dəstəyi ilə öz fəaliyyətlərini aktiv şəkildə davam etdiriblər. Sizləri universitetimizin əsas tələbə təşkilatları olan ADPU TGT, ADPU THİK, ADPU YAP GB və ADPU TKİB-in il ərzində həyata keçirdikləri bəzi layihələrlə tanış etmək istəyirik. Qeyd edək ki, 2020-ci il dünyada və xüsusən ölkəmizdə yaşananan hadisələr fövqündə birliyin nə qədər zəruri olduğunu göstərdi. Bu baxımdan ADPU-nun tələbələri və tələbə təşkilatları da bu tarixi anlarda bütün fərqləri kənara qoyaraq həmrəy və birgə fəaliyyət nümayiş etdirdilər. Elə təkcə bu nüans ADPU-nun tələbə təşkilatlarının il ərzindəki ən böyük uğuru sayıla bilər. Müzəffər Ali Baş Komandanın dediyi kimi: #bizbirlikdəgüclüyük!

### ADPU TGT onlayn Hesabat Konfransı keçirib



Dekabrın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin Tələbə Gənclər Təşkilatının (ADPU TGT) "Zoom" platformasında onlayn formatda XV illik Hesabat Konfransı keçirilib. 100-dən artıq fəal TGT üzvünün qatıldığı konfransda ADPU-nun rektoru, prof. Cəfər Cəfərov, Sosial və Humanitar məsələlər üzrə prorektor, prof. Fikrət Rzayev, Tədris işləri üzrə prorektor, dos. Eldar Aslanov, Ümumi işlər üzrə prorektorTural Cəlilov, Strateji inkişaf üzrə rektor müşaviri Ümid Mehdiyev, fakültə dekanları və dekan müavinləri, Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ) sabiq sədri Faiq Məmmədov və hazırkı sədri Pərviz Mirələmli iştirak edib. Rektor C.Cəfərov müzəffər Ali Baş Komandanın rəhbərliyi ilə rəşadətli Ordumuzun 30 ilə yaxın işğal altında olan torpaqlarımızı azad etməsi münasibətilə iştirakçıları təbrik edib, Vətən müharibəsində Azərbaycan gəncliyinin, o cümlədən ADPU tələbələrinin həm ön, həm də arxa cəbhədə fəaliyyətini yüksək dəyərləndirib. ADPU TGT sədri İsmayıl Nəsirov təşkilatın son 1 illik hesabatını təqdim edərək, bildirib ki, pandemiya dövründə 200-dən artıq onlayn layihə icra olunub, informasiya məkanında aktiv fəaliyyət göstərilib. Çıxış edənlərdən prof. F. Rzayev, prof. F.Rüstəmov, Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli, Faiq Məmmədov və Parviz Mirələmli tələbələrə qarşıdan gələn imtahan sessiyasında və gələcək ictimai fəaliyyətlərində uğurlar arzu edib, pandemiya və Vətən müharibəsi dövründə ADPU TGT-nin fəaliyyətindən razılıqlarını bildiriblər. Konfransda Vətən müharibəsində Şəhidlərinin xatirəsi 1 dəqiqəlik sükutla yad edilib, Dövlət Himni səsləndirilib. Yekunda ADPU TGT-nin 2020-ci ildəki işində fərqlənən tələbələr mükafatlandırılıb.

### ADPU-nun ictimai təşkilatları 20 Yanvar Şəhidlərinin xatirəsini yad edib.

Yanvarın 20-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin təşəbbüsü ilə 20 Yanvar Şəhidlərinin xatirəsinə həsr edilmiş onlayn müzakirə keçirilib. Görüşdə şöbənin müdiri Turan Kərimli, mütəxəssis Cavid Hüseynov, ADPU-nun Tələbə Gənclər Təşkilatının sədri İsmayıl Nəsirov, Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədrinin I müavini Səkinəxanım Mirzəzadə, ADPU YAP Gənclər Birliyinin sədri Tərlan Ağayev, ADPU Təhsil Könüllüləri İctimai Birliyinin sədri Taleh Mirzəyev, təşkilatların rəhbər heyətləri, habelə ADPU SMM komandasının üzvləri iştirak edib. Görüşdə şəhidlərimizin xatirəsi 1 dəqiqəlik sükutla yad edilib, ardınca 20 Yanvar hadisələri ilə bağlı ADPU-nun ictimai təşkilatlarının gördüyü işlər təqdim olunub, bu hadisələrin qan yaddaşından əlavə xalqımızın şanlı azadlıq tarixi olduğu vurğulanıb. 021-ci ildə Zəfər tariximizin və şəhidlərimizin təbliği istiqamətində fəaliyyət planı müzakirə olunub, təkliflər dinlənilib. Qeyd olunub ki, ADPU-nun Vətən müharibəsindəki 11 nəfər Şəhidi var. Bu Şəhid və qazilər haqda "ADPU Qəhrəmanları" kitabının tərtibi, o cümlədən digər silsilə tədbirlərin icrası və bu işlərdə tələbələrin ictimai töhfəsinin önəmindən söz açılıb.

### ADPU THİK-dən H.Əliyevin doğum gününə həsr edilmiş onlayn konsert proqramı



May ayının 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin Tələbə Həmkarlar İttifaqı Komitəsinin (ADPU THİK) təşkilatçılığı ilə Ulu Öndər Heydər Əliyevin anadan olmasının 97 illiyinə həsr edilmiş onlayn konsert proqramı keçirilib. Konsert proqramında ifaları ilə hər birimizin sevimlisi olan Vüqar Muradov və ADPU THİk-in "Bədii yaradıcılıq müsabiqəsi-2" layihəsinin qalibləri öz ifaları ilə xüsusi iz qoyublar. Qeyd edək ki, konsert proqramı Tələbə Həmkarlar İttifaqı Komitəsinin rəsmi sosial media səhifələrində canlı yayımlanmış və tələbələr tərəfindən xeyli maraqla qarşılanmışdır.

### Təhsil Könüllüləri İctimai Birliyinin könüllüləri ADPU Şəhidləri haqda Vikipediyada məqalələr yaradıblar




Bildiyimiz kimi Vətən müharibəsində ADPU-nun 11 tələbə və məzunu Şəhidlik zirvəsinə ucalıb. ADPU Təhsil Könüllüləri İctimai Birliyinin fəalları (ADPU TKİB) Şəhidlərimizin əziz xatirəsini yaşatmaq və təbliğ etmək, qlobal informasiya müharibəsində fəal olmaq məqsədlə ADPU-nun Şəhidləri haqda Vikipediya açıq ensiklopediyasında məqalələrin yaradılmasına başlamış və qısa zamanda təşkilatın könüllüsü İntiqam Mərdanlı və məzunumuz Aynur Yusifzadə 5 Şəhidimiz - Ceyhun Nüsrətli, Firdovsi Tahirov, Elgün Əzizov, Cilingir Nəbiyev və Qoşqar Ömərov haqqında məqalələr yaradaraq virtual ensiklopediyaya daxil etmiş, əvvəlcədən mövcud olan digər Şəhidlərimiz haqqındakı məqalələrdə isə lazımi redaktə işləri aparmışlar. Bununla da ADPU-nun Vətən müharibəsindəki hər bir Şəhidi haqda Vikipediyada məqalə yaradılmış oldu. Könüllülərimizə bu nəcib və faydalı işləri üçün təşəkkür edirik. Qeyd edək ki, ADPU TKİB bu fəaliyyətləri sistemləşdirmək məqsədi ilə bu ilin fevralından etibarən VİKİADPU adlı ödənişsiz layihəyə start verir ki, burada tələbələr onlayn olaraq peşəkar təlimçi tərəfindən vikipediyada məqalə yaratmaq təlimlərinə cəlb ediləcəklər.

### ADPU YAP Gənclər Birliyi ADPU-da ilk dəfə onlayn yarış təşkil edib

Azərbaycan Dövlət Pedaqoji Universitetinin Yeni Azərbaycan Partiyası Gənclər Birliyi (ADPU YAP GB) nəzdində İntellektual Oyunlar Klubunun (İOK) təşkilatçılığı ilə pandemiya şəraitində universitetdə ilk rəsmi onlayn yarış təşkil edilib. 2020-ci ilin mart ayının 22-si, 24-ü , 27-si və aprel ayının 14-də keçirilən yarışlarda universitet tələbələrindən ibarət 30 komanda, 130-dan çox tələbə iştirak edib. Maraqlıdır ki , hər oyun günü fərqli komanda qalib gəlib.Qalib komandalar onlayn qaydada mükafatlandırılıb.

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ
YENİ AZƏRBAYCAN PARTİYASI GƏNCLƏR BİRLİYİ
İNTELLEKTUAL OYUNLAR KLUBU

| 22 MART | 24 MART | 27 MART | 14 APREL |
|---|---|---|---|
| 1.Poliqon - 9 | 1.Likantropiya - 10 | 1.Bermud - 7 | 1.Hamıya qarşı - 14 |
| 2.Ha kuna - 9 | 2.Nuer - 10 | 2.İnvincible - 6 | 2. 1918 - 13 |
| 3.Nuer - 8 | 3.Albus - 9 | 3.Clentificos - 6 | 3.Vendetta - 12 |
| 4.Everest - 4 | 4.Ha kuna -7 | 4.XX kalibr-6 | 4.Ha kuna - 12 |
| 5.Chance - 3 | 5.Poliqon - 4 | 5.Chance -6 | 5.Excalibur - 9 |
| 6.Ebola - 3 | | 6.Poliqon -6 | |

# QARABAĞ ZƏFƏRİ

10 noyabrda imzalanan üçtərəfli sazişə əsasən dekabrın 1-də ərazisi 1800 km2 olan Laçın rayonunun erməni işğalçılarından azad olunması ilə noyabrın 10-da imzalanmış birgə Bəyanatın daha bir müddəası icra olundu. Beləliklə, Cəbrayıl, Füzuli, Zəngilan, Qubadlı, Şuşa müharibə yolu ilə, Ağdam, Kəlbəcər, Laçın isə diplomatiya yolu ilə işğaldan azad olundu. Şanlı Azərbaycan Ordusunun sentyabrın 27-də Qarabağda başladığı uğurlu əks-hücum əməliyyatı nəticəsində noyabrın 9-dək 5 şəhər, 4 qəsəbə və 286 kənd işğaldan azad edilmişdi. Gəlin, qələbəmizin qısa xronologiyası ilə tanış olaq.

**27 sentyabr - Bütün cəbhə boyu qoşunlarımızın əks-hücum əməliyyatı başlandı.**

**03 oktyabr – Tərtər rayonunun Suqovuşan və Talış kəndləri işğaldan azad olundu**

**04 oktyabr – Cəbrayıl şəhəri işğaldan azad olundu**

**16 oktyabr – Xudafərin körpüsü üzərində Azərbaycan bayrağı qaldırıldı**

**17 oktyabr - Füzuli şəhəri işğaldan azad olundu**

**20 oktyabr - Zəngilan şəhəri işğaldan azad olundu**

**25 oktyabr - Qubadlı şəhəri işğaldan azad olundu**

**08 noyabr - ŞUŞA şəhəri işğaldan azad olundu**




10 noyabr – Azərbaycan Respublikasının Prezidenti, Ermənistan Respublikasının baş naziri və Rusiya Federasiyasının Prezidentinin bəyanatına əsasən Dağlıq Qarabağ münaqişəsi zonasında atəşin və bütün hərbi əməliyyatların tam dayandırılması elan olunub. Bəyanata əsasən 2020-ci il noyabrın 15-dək Kəlbəcər rayonu , noyabrın 20-dək Ağdam rayonu , dekabrın 1-dək isə Laçın rayonu Azərbaycana qaytarılmalıdır.

20 noyabr – Noyabrın 10-da imzalanmış üçtərəfli bəyanata uyğun olaraq, Ağdam rayonu Azərbaycana təhvil verilib. Bununla da rayonun işğal edilmiş 73 faiz ərazisi azad olunub. Rayonda ümumilikdə 138 yaşayış məntəqəsi var.



25 noyabr – Üçtərəfli bəyanata əsasən, Kəlbəcər rayonu da Azərbaycana təhvil verilib. Kəlbəcər ərazi baxımından respublikamızın ən böyük rayonlarından biridir. İşğaldan əvvəl rayonda 147 yaşayış məntəqəsi olub.

7 dekabr – Üçtərəfli bəyanata uyğun olaraq, Ermənistan silahlı birləşmələri Laçın rayonundan çıxıblar. Rayon Azərbaycan Silahlı Qüvvələrinə təhvil verilib. Qeyd edək ki, ərazisi 1800 kvadratkilometr olan Laçın rayonunda 1 şəhər, 1 qəsəbə və 125 kənd olmaqla, ümumlikdə 127 yaşayış məntəqəsi var.

10 dekabr - Bakıda Azadlıq Meydanında Zəfər Paradı - Azərbaycanın qələbəsi şərəfinə Bakıda keçirilən taixi hərbi parad. Paradda 3000 Azərbaycan əsgəri və zabiti ilə yanaşı türk əsgər və zabitləri də iştirak etmişdir. Zəfər Paradını Azərbaycan Silahlı Qüvvələrinin Ali Baş Komandanı , Azərbaycan Respublikası Prezidenti İlham Əliyev və fəxri qonaq kimi dəvət olunmuş Türkiyə prezidenti Rəcəb Tayyib Ərdoğan qəbul etmişdir.

Parada Müdafiə Nazirinin müavini general-leytenant Kərim Vəliyev komandanlıq etmişdir. Şuşa şəhəri azad edildikdən sonra, Azərbaycan hərbçiləri tərəfindən şəhər üzərində qaldırılan Zəfər bayrağı parada gətirilmişdir. Müharibə zamanı qənimət kimi ələ keçirilmiş Ermənistan Silahlı Qüvvələrinə məxsus hərbi texnikanın bir qismi nümayiş olunmuşdur.

Azadlıq Meydanında keçirilən hərbi paradda 150-dək hərbi texnika, o cümlədən silahlanmaya yeni qəbul edilmiş müasir hərbi texnika, raket və artilleriya qurğuları, hava hücumundan müdafiə sistemləri, eləcə də hərbi gəmi və katerlər nümayiş etdirilmişdir.




## Xudayar təsnifi

Dumanlı dağların başında durdum,
Dumandan özümə bir Xeymə qurdum,
Keçdi xəyalımdan öz gözəl yurdum,
Dumanlar içində duman görünür.

Xəzər Dənizi tək Eşqimlə coşdum,
Xülyalar içində sanki bihuşdum,
Vətən arzusu ilə nəğmələr qoşdum,
Tufanlar gözümdə dastan görünür.

Könüllər cəlb edən Bu xoş mənzərə,
Şövqümü Artırdı şerə qəzələ,
Çatdıqca Vətənim, elim nəzərə,
Təbiət də mənə heyran görünür.

Deyirlər bülbülə çəmən yaxşıdır,
İnsan üçün laləzar Vətən yaxşıdır,
Vahid sorma Vətən nədən yaxşıdır,
Adı gələcək könlüm xəndan Görünür





Topçu Vüsal Şahkərimov

# AZƏRBAYCAN GÜNDƏMİ - 2020

## "Könüllülər ili"

Azərbaycan Respublikası Prezidenti cənab İlham Əliyevin 30 dekabr 2019-cu il tarixində imzaladığı sərəncama əsasən 2020-ci il Azərbaycan Respublikasında "Könüllülər ili" elan edildi. Könüllülük insanları vahid niyyət ətrafında birləşdirən, cəmiyyət və dövlətin birgə fəaliyyətinin ən uğurlu formatıdır. Könüllülük həm də vətənpərvərlik məktəbi, öz xalqına, dövlətinə, milli-mənəvi dəyərlərə bağlılıq və xidmət örnəyidir. Azərbaycanda "Könüllülük məktəbi" çoxşaxəlidir. "BİR" Tələbə könüllüləri , ASAN könüllüləri , "Regional İnkişaf" İctimai Birliyi kimi könüllü hərəkatları yaranmış , mərkəzi və yerli icra orqanlarında on minlərlə gənci birləşdirən könüllü qrupları formalaşmışdır. Ölkəmizdə Avroviziya Mahnı Müsabiqəsi, I Avropa Oyunları , "Formula 1" yarışları , IV İslam Həmrəyliyi Oyunları kimi irimiqyaslı beynəlxalq tədbirlərin həyata keçirilməsində könüllülərin rolu əvəzsizdir. 2020-ci ilin "Könüllülər ili" elan olunması da ölkəmizdə könüllülüyün yeni mərhələyə qədəm qoyduğunu və böyük potensiala malik olduğunu nümayiş etdirmişdir.

## II Qarabağ müharibəsi

27 sentyabr 2020-ci il tarixində Azərbaycan Respublikası Müdafiə Nazirliyinin bütün sosial şəbəkə hesablarında bir məlumat paylaşıldı - "Bütün cəbhə boyu qoşunlarımız əks-hücum əməliyyatına başlayıb". Əslində isə bu tarix qırx dörd günlük "Vətən müharibəsi"nin başlanğıcı idi. Müharibənin ilk qığılcımları artıq iyul ayında özünü göstərmişdi. Tovuz döyüşlərində general-mayor Polad Həşimov və polkolnik İlqar Mirzəyev başda olmaqla on iki hərbiçi və bir mülki vətəndaşımız şəhid oldu. Bu döyüşlər ərəfəsində yüzminlərlə həmvətənlərimiz orduya öz dəstəyini göstərdi, rayon hərbi komissarlıqlarına hər gün minlərlə insan gələrək könüllü şəkildə döyüşə getmək üçün sıraya yazıldılar. 27 sentyabr tarixindən etibarən bütün dünyanın mərkəzi Qarabağ idi. Artıq Qaarabağın öz sahibləri geri qayıdırdı. Otuz il ərzində düşmənlər tərəfindən qazılan səngərlər , qurulan istehkamlar və başqa müdafiə qurğuları bir neçə saatın içində darmadağın edildi. Cəbrayıl və Füzuli rayonlarında böyük strateji əhəmiyyəti olan kəndlər işğaldan azad edildi. Təkcə hərbi yox , siyasi gücümüzü də ortaya qoyduq. Ali Baş Komandan cənab İlham Əliyevin xarici , amma "ermənipərəst" telekanallar verdiyi müsahibələr , Xarici İşlər Naziri cənab Ceyhun Bayramovun görüşləri , Azərbaycan Respublikası Prezidentinin köməkçisi cənab Hikmət Mirzəyevin verdiyi açıqlamalar da bunu əyani şəkildə sübut edir. Döyüş bölgəsində düşmənə sarsıdıcı zərbə vuran müzəffər və rəşadətli ordumuz 4 oktyabrda Cəbrayıl, 17 oktyabrda Füzuli, 20 oktyabrda Zəngilan, 25 oktyabrda Qubadlı və 8 noyabr tarixində Şuşa şəhərini düşməndən azad etdi. Ordumuz qabağında əzildiyini qəbul edən düşmən tərəfi məğlubiyyəti qəbul edərək kapitulyasiya aktına imza atmağa məcbur oldu. Müqaviləyə əsasən işğal altında olan digər ərazilərimiz də bizə qaytarıldı. Bütün dünyanın diqqətində olan bu döyüşlər tarixdə "Dəmir yumruq" əməliyyatı kimi qalacaq. Müharibə zamanı 2855 nəfər şəhidlik zirvəsinə ucaldı. Allah Rəhmət Eləsin

## Koronavirus

İlk dəfə Çinin "Yuhan" şəhərində aşkar olunmuş , daha sonra bütün dünyaya yayılan koronavirus ilk dəfə 28 fevral tarixində ölkəmizdə peydə oldu. Mart ayının ilk həftəsində təhsil ocaqlarında dərslərin keçirilməsi qeyri-müəyyən müddətə təxirə salındı. Bir müddət sonra isə bütün respublika karantinə alındı. Pandemiya bütün dünya ölkələri kimi Azərbaycanın iqtisadiyyatını da iflic vəziyyətə saldı. Bu səbəbdən dövlət tərəfindən iri, orta və xırda sahibkarlara, həmçinin işsizlərə, kredit borcu olan şəxslərə yardımlar və güzəştlər olundu. Bu günə kimi iki yüz mindən artıq vətəndaşımız bu virusa yoluxmuşdur. Onlardan 3064 nəfər isə dünyasını dəyişmişdir. 2020-ci təqvim ilinin sonunda bir sıra ölkələr öz vaksinlərini təqdim etmişdir. Azərbaycan isə Çinin "Sinovac" şirkətinin "CoronaVac" adlı vaksinindən istifadə etməyi qərara almışdır.



## Azərbaycan İdmanı - 2020

Koronavirus pandemiyasının ən çox təsir göstərdiyi istiqamətlərdən biri də idman yarışları olmuşdur. Ard-arda böyük idman yarışları növbəti illərə təxirə salınmışdır. "Bakı Olimpiya Stadionu"nun evsahibliyi etmək hüququ qazandığı futbol üzrə "Avropa çempionatı" və "XXXII Yay Olimpiya Oyunları" eyni səbəbdən - pandemiyaya görə baş tutmamışdır. 2020-ci ildə futbolda ən böyük uğurumuz isə "Qarabağ FK"-un Avropa Liqasının qrup mərhələsinə vəsiqə qazanması olmuşdur. Hər zaman dünya arenasında öz sözünü demiş Güləş yığmamız 6 medalla Avropa üçüncüsü olmuşdur. Geridə qoyduğumuz ildə idmanda ən böyük uğuru , sözsüz ki , şahmatda qazandıq. 2020-ci ilin dekabr ayında başlayıb 2021-ci ilin 3 yanvar ayında bitən "Airthings Masters" turnirində Teymur Rəcəbov finalda erməni şahmatçı Levon Aronyanı iki görüşdə də mat edərək çempion olmuşdur.




## Parlament seçkiləri

Azərbaycan Respublikası Prezidenti cənab İlham Əliyevin 5 dekabr 2019-ci il tarixli sərəncamına əsasən "Beşinci çağırış Azərbaycan Respublikasının Milli Məclisi" buraxılmışdır. Buna əsasən 2020-ci ilin fevral ayının 9-da növbədənkənar parlament seçkiləri keçirilmişdir. Bu , müstəqillik tariximizdəki ilk növbədənkənar parlament seçkiləri olmuşdur. Parlament seçkilərinə nəticələrinə əsasən Milli Məclisdə deputat mandatlarının böyük əksəriyyətinə iqtidar partiya olan "Yeni Azərbaycan Partiyası" sahib olmuşdur.




## "İtaliyada Azərbaycan ili"

2020-ci il İtaliyada "Azərbaycan" olaraq qeyd edildi. Bunu İtaliya Respublikasının Prezidenti Sercio Mattarella fevralın 20-də geniş tərkibdə görüşdən sonra Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev ilə mətbuata bəyanatlarla çıxış edərkən deyib. İtaliya Prezidenti bildirib ki, Azərbaycan dialoqa çox açıq və bütün dünya tərəfindən görünən müasir bir ölkədir: "Burada mən, həmçinin Qoşulmama Hərəkatına Azərbaycanın üçillik sədrliyini qeyd etmək istəyirəm. Azərbaycan bu öhdəliyi öz üzərinə götürmüşdür və bu, onun beynəlxalq sahədəki işini daha da gücləndirəcək.





# Dünya gündəmi - 2020

## Koronavirus Pandemiyası

2019-cu ilin dekabr ayında meydana çıxan və Çinin Ohan vilayətində sürətlə yayılan yeni növ koronavirus epidemiyası qısa müddətdə Çinin və dünya ictimaiyyətinin gündəminini zəbt etdi. 2020-ci ilin ilk ayında Çində on minlərlə insana yoluxan koronavirus, digər ölkələrə də bulaşaraq dünyanın düzənini pozdu.COVID-19 dalğası hələ 2020-ci ilin martında Ümumdünya Səhiyyə Təşkilatı (ÜST) tərəfindən "pandemiya" elan edilmişdi. Epidemiyanın özəyi isə əvvəlcə Çindən Avropaya, sonra isə ABŞ və Cənubi Amerikaya keçdi.İyun ayının sonunda dünyada Covid-19 virusuna yoluxanların sayı 10 milyona, ölənlərin sayı isə 500 minə çatdı. 5 milyondan çox xəstə sağaldı.Ümumdünya Səhiyyə Təşkilatı Covid-19-un "endemik" ola biləcəyini açıqladı. Koronavirusun yazın ilk aylarında yayılması nəticəsində bir çox ölkələrdə ciddi təhlükəsizlik tədbirləri görüldü. Ölkələr arasındakı sərhədlər bir müvəqqəti bağlandı, və Covid-19-la bağlı məhdudiyyətlər isə iqtisadi fəallığı ləngitdi, bir çox müəssisələr iflasla uğradı.Milyonlarla insan komendant saatları və karantin rejiminə görə evlərinə qapandı.

## Dünya idmanı - 2020

UEFA Avro 2020 turnirinin 2020-ci il 12 iyun-13 iyul tarixində keçirilməsi planlaşdırılsa da, koronavirus pandemiyasına görə 1 il təxirə salındı. Yaponiyanın paytaxtı Tokio şəhərində il 24 iyul - 9 avqust tarixlərində keçirilməsi planlaşdırılan Tokio Yay Olimpiya oyunları koronavirus pandemiyasına görə 1 il təxirə salındı




## ABŞ Prezident seçkiləri



ABŞ-da prezident seçkiləri – 7 milyon marjla prezident seçkilərində Joe Biden Donald Trump üzərində qələbə qazanır.

## "Pakistan hava yollarında qəza"

22 may 2020-ci ildə Pakistanda böyük hava qəzası baş verdi. Lahor-Karaçi marşrutu üzrə PK-8303 daxili reysini həyata keçirən Pakistan Beynəlxalq Hava Yollarının Airbus A320 təyyarəsi, Karaçiyə ikinci yaxınlaşma zamanı Cinnah Hava Limanı yaxınlığında yerləşən yaşayış məntəqəsində qəzaya uğradı. Qəza, Karaçi Hava Yolları Nəzarətinin təyyarəsi ilə əlaqəni itirməsindən sonra baş verib. Təyyarədə olan 99 nəfərdən (91 sərnişin və 8 ekipaj üzvü) cəmi 2 nəfər sağ qala bildi.



## "Miqrasiya böhranı"

İdlibdə türk əsgərlərinə edilən hücumdan sonra türk tərəfi Avropa sərhədlərini miqrant axınının sərbəst hərəkətinə açdı. Yunan sərhədçiləri mühacirlərin ölkələrinə girişinin qarşısını almaq üçün lazımi tədbirlər gördülər və Türkiyə ilə Yunanıstan arasında münasibətlər kəskinləşdi. Ümumilikdə minlərlə mühacir Türkiyə sərhədlərinə axışdı.



## "Avstraliyada meşə yanğınları"

Avstraliyada yanğınlar: 1.25 milyard heyvan həlak olduŞübhəsiz, 2020-ci ilin yanvar ayında ən çox müzakirə olunan hadisə Avstraliyada uzun aylar davam edən meşə yanğınları oldu. Yanğın nəticəsində 25 nəfər öldü, 8 milyon hektar meşə və yaşıl sahə məhv edildi. Ümumdünya Təbiəti Mühafizə Fondu (WWF) təxminən 1.25 milyard heyvanın həlak olduğunu təxmin edir. Avstraliyanın Sığorta Agentliyi ümumi itkinin 700 milyon dolları keçdiyini, təxminən 2 min evin yanıb kül olduğunu açıqladı.



## Distant təhsil zamanı tələbələrə faydalı olacaq internet resursları

**www.iienstitu.com** İstanbul İşletme İnstitutu tərəfindən hazırlanıb. Burada insan resursları, marketinq, mühasibatlıq, xarici dil, ünsiyyət texnikaları, şəxsi inkişaf və s. barədə onlayn dərslər var. Dərslər türk dilindədir. Tələbələr ilkin qeydiyyat və kurs seçimi proseslərini iienstitu.com saytından edirlər. Dərslər isə uzem.iienstitu.com saytında yayımlanır. İİE-nin sertfikatı ödənişlidir.

**www.khanacademy.org** dünya səviyyəli onlayn platformalardan biridir. İqtisadiyyat, maliyyə, sənət, humanitar elmlər, kompüter elmlərinə aid video dərs və testlər mövcuddur. Tədris ingilis dilindədir.

**www.edx.org** tərkibində Data analitikası, Dil, Mühəndislik, Kompüter elmləri, Menecment və s. sahələri birləşdirir. Bu sahələr onlayn tədris edilir.

**Campusonline.com** 2010-cu ildə yaradılmış onlayn təhsil platformasıdır. Digər kurslar kimi, Campus Online-nin tərkibində də müxtəlif ödənişli kurslar var. Sonda isə sertfikat verilir.

**Datacamp.com** adından da göründüyü kimi, DataCamp, Data analitikasına dair kiçik və böyük ölçülü dərsləri tədris edən platformadır. Kursu uğurla bitirən tələbələrə sertfikat verilir



## Ukrayna təyyarəsinin İran tərəfindən vurulması

İran tərəfi təsadüfən Ukrayna hava yollarına məxsus sərnişin təyyarəsini vurdu. İran raketinin təyyarə ilə toqquşması nəticəsində təyyarədəki bütün insanlar (176 nəfər) həlak oldu. Hadisə İran və Ukrayna arasında beynəlxalq böhrana səbəb oldu. İran rəsmiləri ilk açıqlamalarında təyyarənin mexaniki zədə səbəbindən qəzaya uğradığını söylədilər.



## "Van şəhərində uçqun"

Türkiyənin Van şəhərində Bu ilin fevral ayında Baxçaşəhər bölgəsində uçqun baş verdi. İlkin məlumatlara görə, iki nəfər itkin düşdü. İtkin düşən şəxsləri axtarmaq üçün təşkil edilən xilasetmə qrupunun üzvləri də uçqun altında qaldı. Ümumilikdə uçqun nəticəsində 41 nəfər öldü.

# ELANLAR

## "ADPU Qəhrəmanları" kitabının hazırlanmasına qatqın olsun!

ADPU-nun 100 illiyi ilə bağlı və Vətən müharibəsi şəhidlərinin xatirəsinə "ADPU-nun Qəhrəmanları" başlığı ilə universitetin fəaliyyətə başladığı dövrdən bu günə qədər Şəhid, qazi olmuş və böyük qəhrəmanlıqlar göstərmiş tələbə və məzunları haqda ADPU 100 seriyasından nəfis tərtibatda kitabın nəşri və elektron məlumat bazasının yaradılmasını nəzərdə tutulur. Bununla bağlı məlumatları tamlaşdırmaq üçün ADPU rəhbərliyi bütün məzunlarına və onların ailələrinə, habelə ölkə əhalisinə müraciət edərək xahiş edir ki, ADPU-nun yarandığı 1921-ci ildən bəri universitetin Vətən uğrunda, İkinci Dünya müharibəsində, 20 Yanvar faciəsində, I Qarabağ müharibəsi və atəşkəs dövründə, xüsusən 2016-cı ilin Aprel, 2020-ci ilin iyul və Vətən müharibəsində Şəhid, qazi olmuş və əfsanəvi qəhrəmanları haqda məlumatları bizə göndərsinlər.

**Aşağıdakı məqamlara diqqət etmək xahiş olunur:**

*– ADPU-nun vaxtilə Xankəndində fəaliyyət göstərən filialı,*
*– Keçmiş Azərbaycan Müəllimlər İnstitutunun və onun hazırda ADPU tərkibində fəaliyyət göstərən Cəlilabad, Şəki, Şamaxı, Quba və Ağcabədi filiallarının,*
*– ADPU nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin də tələbə və məzunları bura daxildir.*

Məlumat vermək üçün qəhrəmanımız haqda yazılı məlumat və həyat, təhsil və döyüş yolunu əks etdirən 2-3 fotosunu aşağıdakı əlaqə vasitələrindən hər hansı birinə göndərə bilərsiniz.

– E-poçt: adpuqehremanlari.100@gmail.com
– Tel (whataspp):
+994 50 868 08 33 – Cavid Hüseynov
+994 513432822 – Taleh Mirzəyev
– ADPU-nun rəsmi instaqram və tvitter səhifələri
Məlumatların qəbulunun son tarixi: 28. 02.2021-ci il
Qeyd: Bu böyük işdə yardımçı olan hər bir şəxs və qurumun adı kitabın müəllifləri sırasına daxil olunacaq.

**Sosial və Humanitar məsələlər üzrə prorektorluq**

## ADPU tələbələri üçün Danimarkada təhsil almaq imkanı

Erasmus+ KA1 mübadilə proqramı xətti ilə xaricdə təhsil almaq istəyən tələbələrimizin nəzərinə!

Kopenhagen Universitet Kolleci (Danimarka) ilə Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) arasında mövcud ikitərəfli Erasmus+ mübadilə proqramına əsasən universitetimizin 5 tələbəsi 2021/2022-ci tədris ilinin payız semestri (5 ay) müddətində Danimarkada təhsilini davam etdirmək imkanı əldə edəcək.

**Kimlər müraciət edə bilər?** Filologiya fakültəsinin İngilis dili və Fransız dili müəllimliyi ixtisası, Tarix və coğrafiya fakültəsinin Sosial İş ixtisası və Məktəbəqədər təhsil fakültəsinin II və III kurs bakalavr pilləsində təhsil alan tələbələr*
İngilis dili: B2
Təqaüd səyahət və yaşayış xərclərini əhatə edir. Qeyd edək ki, müsahibələr mart ayında online olaraq keçiriləcəkdir. Seçilən namizədlərin online qeydiyyatı aprel ayında baş tutacaqdır.
Məlumat və müraciət üçün:
gunay.maharramova@adpu.edu.az
Son müraciət: 1 mart 2021-ci il

## "TYUTOR (AKADEMİK MƏSLƏHƏTÇİ) HAZIRLIĞI" ÜZRƏ SERTİFİKAT PROQRAMI

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Davamlı təhsil və innovasiyalar şöbəsinin "Tyutor (akademik məsləhətçi) hazırlığı" kursu aşağıdakı tədris modullarından ibarətdir:
- təhsil qanunvericiliyinin ətraflı araşdırılması və tədris prosesinə tətbiqi
- tədris sənədlərinin tərtibi qaydaları
- tələbələrlə davranış qaydaları və onlarla işin psixoloji xüsusiyyətləri
- ingilis dili səviyyəsinin yüksəldilməsi
- situasiyaların həlləri
- texniki bacarıqların artırılması

Ödənişli əsaslarla Microsoft Teamsdə onlayn təşkil olunan təlim 2 ay davam edir. Təlimi müvəffəqiyyətlə bitirənlərə təlimdəki fəaliyyətləri və imtahandan toplayacaqları bala görə müvafiq sertifikat təqdim olunacaq.

Tarix: 25.01.2021 - 15.03.2021
Tələb olunan sənədlər:
- Şəxsiyyət vəsiqəsinin surəti;
- Ali təhsil haqqında sənədin (diplomun) surəti;
- İş yerindən arayış (işləyənlər üçün);
- CV (anket)
- 3x4 sm ölçüdə 2 ədəd fotoşəkil.

Son müraciət: 22.01.2021-ci il
Tel(whatsapp): +994502104274
E-mail: davamli_tehsil@mail.ru

Qeyd: ADPU, onun filiallları və ADPK nümayəndələrinə, eləcə də, eyni müəssisədən iştirakçıların sayı beş nəfərdən çox olduqda ödənişə güzəşt nəzərdə tutulur.

# XƏBƏRLƏR

## "Təhsildə güzəşt və ADPU təcrübəsi" adlı canlı müzakirə




Yanvarın 18-də Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ) təşkilatçılığı ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rəhbərliyi ilə "Təhsildə güzəşt və ADPU təcrübəsi" adlı tələbələr və ictimaiyyət üçün canlı yayım keçirilib. ATGTİ-nin rəsmi feysbuk səhifəsi üzərindən yayımlanan müzakirələrdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Sosial və Humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan, mütəxəssis Cavid Hüseynov, ATGTİ-nin sədri Pərviz Mirələmli və ADPU TGT-nin sədri, ATGTİ-nin sədr müavini İsmayıl Nəsirov iştirak edib. Prof. C.Cəfərov son 5 ildə ADPU-dakı keyfiyyətyönümlü islahatlardan məlumat verərək ADPU-nun özünün 100 illiyində qarşısına qoyduğu strateji hədəflərə tam potensialı ilə irəlilədiyini, bu sahədə onlayn təhsildə də müəyyən texniki və metodiki işlərin aparıldığını qeyd edib, növbəti 5 illiyin hədəflərindən danışıb. Bu dönəmdə tələbələr və ictimaiyyətlə əlaqə və əks-əlaqənin qurulması haqda prof. F. Rzayev, tədirisin spesifik məsələlərindən isə dos. E. Aslanov məlumat verib. Tələbələrdən gələn suallar cavablandırılıb.

## ADPU TV youtube kanalı fərqli formatda fəaliyyətə başlayır

ADPU-nun İctimaiyyətlə əlaqələrini daha da inkişaf etdirmək məqsədi ilə ADPU SMM komandası 2020-ci ilin oktyabrından universitetin rəsmi sosial media hesablarını yenidən qurmuş, instaqram və tvitterdə vahid rəsmi səhifələr yaratmış, ilk dəfə universitetin rəsmi teleqram kanalımı istifadəyə vermişdir. 3 aydan az müddətdə fərqli konseptdə və operativ fəaliyyət göstərən səhifələr tələbələr arasında böyük auditoriya toplamış, instaqram və teleqram səhifələri 5500-dən çox, tvitter səhifəsi 600-dən çox izləyici toplayaraq universitetlər arasında öz fərqini ortaya qoymuşdur. Həmçinin ADPU-nun KİV-lərlə əlaqəsi də operativ əsaslarla qurularaq universitetin fəaliyyətinin tanınan xəbər agentlikləri tərəfindən müntəzəm olaraq edilmişdir. Hazırda komanda ADPU-nun 100 illiyi ilə bağlı bu istiqamətdə fəaliyyətini genişləndirərək youtube platformasında universitetin "ADPU TV" adlı operativ onlayn kanalını yaradıb. Tezliklə davamlı fəaliyyətə başlayacaq layihənin fərqli cəhətləri sırasına kanalda təhsil mütəxəssisləri, təhsilverənlər, tanınmış alimlərlə canlı müsahibələrin, canlı yayımların, müxtəlif səpkidə verilişlərin, rublikaların yayımı, tələbə fəaliyyətlərinin işıqlandırılması aiddir. Kanalın yayım və texniki heyəti könüllü tələbələrdən ibarət olacaq.



Tiraj - 100
Şəhadətnamə - No 191

# GƏNC MÜƏLLİM QƏZETİ

ADPU 100

## 35 Maraqlı Məlumat

1. Gün ərzində bir qutu siqaret çəkən şəxs həyatının hər ilindən bir neçə saniyə məhv edir.
2. Napaleonun əsgərlərinin generala 'SƏN' deyə müraciət etmək hüquqları var idi.
3. Birinci minillikdə 365 min 250 gün, ikinci minillikdə 365 min 237 gün olub. Üçüncü minillikdə isə 365 min 242 gün olacaqdır.
4. Dünyadakı canlılardan düz xətt çəkə bilən yeganə məxluq insandır.
5. Yaponiyaya atılan ilk atom bombası 'Enola Gay', ikinci isə 'Bocks Car' adlanan təyyarələrdə yerləşmişdir.
6. Şampan şüşəsi tıxacının uçuş sürəti saniyədə 14, uçuş məsafəsi isə 12 m-dir.
7. İlk reklam 1477-ci ildə İngiltərədə istehsal olunub. Bu, dua kitabının reklamı idi.
8. Tarixdə ən qısa müharibə 1896-ci il avqustun 27-də Böyük Britaniya ilə Zanzibar arasında baş vermişdir. Bu müharibə 38 dəqiqə davam etmişdir.
9. Gülüş zamanı insanın 17 əzələsi işləyir.
10. İnsanın həyatı boyu başında çıxan tükləri ölçsək 725 km edəcək.
11. Cek-Petroşitel XIX əsrin ən tanınmış qatilidir. O, öz cinayətlərini yalnız və yalnız bazar günləri həyata keçirib.
12. Dahi fizik Albert Eynşteyn öləndə son sözlərini özü ilə 'o dünyaya' aparmışdır. Çünki ölən zaman onun yanında olan tibb bacısı alman dilini bilmirdi.
13. 'Yüzillik müharibə' (1337-1453) fasilələrlə 116 il davam etmişdir.
14. İnsan orqanizmində leykositlər 2-4, eritrositlər isə 3-4 ay yaşayır.
15. Fransızlar barmaqları pus, indeks, macor, anyuler, orikyuler deyə adlandırılar.
16. # - işarəsi adətən 'çərçivə', 'nömrə nişanəsi' və ya 'funt' işarəsi sayılır.Əslində isə işarənin rəsmi adı oktotorpdur.
17. Alimlərin fikrincə insan məktəbi bitirdikdən 22 il sonra sinif yoldaşlarının demək olar hamısının adını və simasını yaddan çıxarır.
18. Roma ordusunda hər çadırda 10 əsgər qalırdı. Hər çadırın öz başçısı seçilir və 'dekan' adlanırdı.
19. Taylandın milli himni 1902-ci ildə rus bəstəkarı Pyotr Şurovski tərəfindən yazılıb.
20. İnsan orqanizmində yaşayan bakteriyalar 2 kq təşkil edir.
21. Gi de Mopassan, Aleksandr Düma, Şarl Quna 'Parisdə Eyfel qülləsinin ucaldılmasına qarşı' protest imzalamışdılar.
22. Bütün ölkənin əsgərləri sağ əllə salam verir.
23. İnsan beynində 1 saniyədə 100 000 kimyəvi reaksiya baş verir.
24. Uşaqlar diz qapaqsız doğulur, qapaqlar 2-6 yaşda yaranır.
25. Həyatı boyu insanın hər barmağı 25 milyon dəfə əyilir.
26. Bir ildə 21 milyon 557 min 600 saniyə var.
27. İlk coğrafi atlas e.ə.150-ci ildə alim Ptolomey tərəfindən yaradılıb, 1477-ci ildə Boloniya şəhərində çap edilib.
28. Məşhur Volterin meyidi XIX əsrin əvvəllərində qəbirdən oğurlanıb, bu barədə yalnız 1864-cü ildə xəbər tutulub.
29. İnsan bədənindəki əsəb impulsları saniyədə 90 m sürətlə dəyişir.
30. Ağciyərin üzəri 100 kvadrat metrdir. Onun üst qatının sahəsi tennis kortunun sahəsinə bərabərdir.
31. Dünya əhalisinin qidasının 70%-dən çoxu 12 çeşiddə bitki və 5 növ heyvandan ibarətdir.
32. Stalinin 70 illiyinə bağışlanmış hədiyyələrin siyahısı elə uzundur ki, onu qəzetlər 1949-cu ilin dekabrından 1953-cü ilin martınadək dərc etməli olmuşdular.
33. İnsan beyni gündə dünyadakı bütün telefonlardan daha çox elektrik impuls edir.
34. Maksimal sayda krossvordu Adrian Bell hazırlayıb. 1930-cu ilin yanvarından 1980-ci ilə qədər o, 'Tayms' qəzetinə 4520 krossvord yollayıb.
35. İngiltərədə çap olunan ilk kitab şahmata həsr olunmuşdur.

## Başsağlığı

Yaxın aylarda ADPU kollektivi və Azərbaycan elmi-pedaqoji mühitinə ağır itkilər üz verib. Belə ki, ötən ilin son aylarında ADPU-nun 7 dəyərli alimi haqq dünyasına qovuşub. ADPU-nun rəhbərliyi və kollektivi mərhum alimlərimizin ailələrinə dərin hüznlə başsağlığı verir, onların vəfatlarından kədərləndiklərini bildirir. Dəyərli alimlərimizin xatirəsi ADPU kollektivinin qəlbində həmişə yaşayacaq. Allah Rəhmət Eləsin!



| | | | | | |
|---|---|---|---|---|---|
| Professor Ələkbər Qurbanov | ADPU-nun Filologiya fakültəsinin sabiq dekan müavini, professor Məhərrəm Hüseynov | ADPU-nun "Fizikanın tədrisi texnologiyası" kafedrasının dosentləri Natiq Əliyev və Tacəddin Vahidov | ADPU-nun uzun illər müəllim və kafedra müdiri, əməkdar incəsənət xadimi, tanınmış bəstəkar Nailə Mirməmmədli | ADPU-nun "Fizikanın tədrisi texnologiyası" kafedrasının dosenti Xəlil Padarov | ADPU-nun "Ədəbiyyatın tədrisi texnologiyası" kafedrasının dosenti, f. ü. f. d. Füzuli Əsgərli |

## Redaksiya heyəti


Professor Cəfər Cəfərov
Müşahidə şurasının sədri


Dosent Eldar Aslanov
Müşahidə şurasının üzvü


Professor Asəf Zamanov
Müşahidə Şurasının üzvü


Professor Fikrət Rzayev
Müşahidə Şurasının üzvü


Tural Cəlilov
Müşahidə Şurasının üzvü


Cavid Hüseynov
Redaktor


Taleh Mirzəyev
Redaktor


Asim İbrahimov
Redaktor


Elvin Vahidov
Dizayner